DOI: https://doi.org/10.36719/2706-6185/13/6-14

**Cavadxan Yusif oğlu Qasımov**
Naxçıvan Dövlət Universiteti
iqtisad üzrə fəlsəfə doktoru
cavadxan.yusifoglu@ndu.edu.az

# NAXÇIVAN MUXTAR RESPUBLİKASINDA FASİLƏSİZ İSTEHSAL PROSESLƏRİNİN İNKİŞAFI REGİONAL DÖVLƏT PROQRAMLARININ İCRASI DÖVRÜNDƏ *(2004-2018-ci illər)*

**Xülasə**

Məqalədə regional inkişafın hərəkətverici qüvvəsi olaraq hüquqi və iqtisadi tənzimləmələrdən bəhs olunmuş, onun sosial-iqtisadi səmərəliliyindən söz açılmışdır. Göstərilmişdir ki, inkişafın hazırkı mərhələsində ölkənin milli iqtisadiyyatı üçün uzunmüddətli perspektivlərə malik olan regional inkişaf üzrə proqramları 2004-cü ildən etibarən icra olunmaqdadır. Artıq IV mərhələsi reallaşan həmin proqramlar bütün iqtisadi rayonları əhatə etməkdədir. O cümlədən, ölkənin ayrılmaz tərkib hissəsi olaraq, Naxçıvan Muxtar Respublikasının da davamlı iqtisadi inkişafına səbəb olmuşdur. Makroiqtisadi zəmində istehsal prosesinin etibarlılığının təmin olunması bütün tərəfləri ilə iqtisadiyyatın sahə strukturunun da əlaqəliliyinə səmərəlilik gətirmişdir. İstər Ümum Daxili Məhsul, istərsə də oun strukturunda yer alan sənaye, tikinti sektorları və kənd təsəsrrüfatının dinamik inkişafı məhz 2004-2018-ci illər üzrə təşəkkültapmışdır. Bu, eyni zamanda, malik olduğu sosial mahiyyyətinə görə də, hər nəfərə düşən məhsul istehsalının illər üzrə davamlılığında da özünü göstərmişdir. Mövzu üzrə aparılan təhlillər şəkillər və diaqramlar vasitəsilə təqdim olunmuşdur.

***Açar sözlər:*** *istehsal, sənaye, ümum daxili məhsul, regional inkişaf, dövlət proqramları, kənd təsərrüfatı, investisiya*

**Javadkhan Yusif Gasimov**
Nakhchivan State University
PhD in economics
cavadxan.yusifoglu@ndu.edu.az

## The development of continious production processes in the Nakchivan Autonous Republic during the implrmentationof regional state programs (*2004-2018 years*)

**Abstract**

The article talks about legal and economic regulations as the driving force of regional development,and talks about its socio-economic efficiency. It has been shown that at the current stage of development, regional development programs, which have long-term prospects for the country's national economy, havebeen implemented since 2004. These programs, which have already been implemented in the IV phase,cover all economic regions. In particular, as an integral part of the country, it has led to the continuous economic development of the Nakhchivan Autonomous Republic. Ensuring the reliability of the production process on the macroeconomic ground has brought efficiency to the connection of the sector structure of the economy with all its aspects. Both the Gross Domestic Product and the dynamic development of the industry, construction sectors and agriculture included in its structure were formed in2004-2018. At the same time, due to its social nature, it was also manifested in the continuity of production per person over the years. The analyzes conducted on the topic were presented through pictures and diagrams.

***Keywords:*** *production, industry, gross domestic product, regional development, state programs, agriculture, investment*

## Giriş

Ölkənin uzunmüddətli milli iqtisadi prioritetlərinə öz töhfələrini verən Naxçıvan Muxtar Respublikası sosial-iqtisadi potensialı ilə artıq geridə qalan müddətlər üzrə makroiqtisadi proseslərin hərəkətverici qüvvəsinə çevrilmişdir. Xüsusilə, 2004-cü ildən uğurla icra olunan Regionların sosial-iqtisadi inkişafına dair Dövlət proqramları çərçivəsində davamlı inkişaf öz etibarlılığını qorumuşdur. Hətta eksklav şəraitdəregional iqtisadi inkişafın Naxçıvan modelini ortaya qoymuş olan uzunmüddətli proseslər milli iqtisadi perspektivlərin də artırılmasına zəmin yaratmış oldu. Təbii olaraq, eksklav anlayışı, özündə, ölkəsininəsas ərazisindən aralıda olan və digər dövlətlər (bir və ya bir neçə) tərəfindən əhatə olunan qeyri-suverenregion mahiyyətini ifadə etməkdədir (Qasımov, 2020: 21).

Xalqımızın ümummilli lideri Heydər Əliyevin müəyyən etdiyi iqtisadi islahatlar proqramı ilə iqtisadiyyatın sahə strukturunun təşkilatlanması, bütün sahələrin məhsuldarlığının artması ilə daha da mütərəqqi əsaslara malik olması, milli iqtisadiyyat quruculuğu proseslərinin sürətlənməsi, makroiqtisadi səviyyədə müqavimətliliyin təmin olunması ölkə iqtisadiyyatına dayanıqlılıq gətirdi.

Qeyd olunanlar öz sosial-iqtisadi, eyni zamanda məntiqi nəticələrini Naxçıvan Muxtar Respublikasının da hərtərəfli inkişafında göstərməkdədir (şəkil 1).

**Şəkil 1.**

**Regional inkişaf üzrə Dövlət proqramlarının icrası dövrlərində Naxçıvan Muxtar Respublikasında Ümumi Daxili Məhsulun həcmi (min manat)**




Şəkil: Naxçıvan MR Dövlət Statistika Komitəsinin materialları əsasında müəllif tərəfindən hazırlanmışdır

Hesablamalar göstərir ki, 2004-2008-ci illərdə muxtar respublikada əsas makroiqtisadi göstərici olan ÜDM-nin həcmi 3,4 dəfədən çox artmışdır. Birinci Dövlət proqramı üzrə hər ötən ilin göstəricisi özündənəvvəlki illə müqayisədə 1,3-1,5 dəfə çox artmışdır.

İkinci Dövlət proqramı üzrə göstəriciləri təhlil edərkən diqqəti bir sıra uğurlar çəkir. İlk olaraq qeydedə bilərik ki, 2009-2013-cü illər ərzində muxtar respublikada ÜDM-nin həcmi 2,4 dəfə artmışdır. Digərtərəfdən, çox əlamətdardır ki, ikinci beşillikdə ÜDM-nin həcmi 2010-cu ildə 1 milyard manatı, 2012-ci ildə isə 2 milyard manatı ötüb keçmişdir. Təhlillər göstərir ki, ÜDM-nin həcmi 2010-cu ildə 2009-cu illə müqayisədə 1,2 dəfə artmışdır. Bu artım 2011-ci illə 2010-cu ilin müqayisəsində 1,5 dəfə təşkil etmişdir. Eyni müqayisə 2012-2011-ci illər üzrə 1,2 dəfə artımla müşayiət olunmuşdur. 2013-cü ildə isə ÜDM-ninhəcmi 2012-ci illə müqayisədə 1,1 dəfə artmışdır.

Qeyd edək ki, üçüncü mərhələnin göstəricilərindən ibarət dinamikadan aydın olur ki, əvvəlki mərhələlər üzrə təşəkkül tapan potensialdan məqsədyönlü şəkildə istifadə olunmuş və iqtisadiyyatın güclü dayaqları yaradılmışdır. Məhz bu əsasda muxtar respublikada 2014-2018-ci illərdə ÜDM-nin həcmi 1,2 dəfə artmışdır ("Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı Dövlət Proqramı"nın 2004-2008-ci illər təsdiq olunması haqqında Azərbaycan Respublikası Prezidentinin Fərmanı).

Artıq regional inkişaf proqramlarının icrasının hər üç mərhələsini yüksək artım dinamikası ilə

geridə qoyan muxtar respublikada milli iqtisadiyyat üzrə perspektivlər nəzərə alınmaqla, güclü baza və potensialformalaşdırılmışdır. Bu mərhələlərdə əhalinin ərzaq təhlükəsizliyi, məşğulluq imkanları, sosial müdafiəsi, təhsil almaq sahəsindəki üstünlükləri və digər amillər əhatəli əksini tapmışdır.

Naxçıvan Muxtar Respublikasında ÜDM-nin illər üzrə artım dinamikasına diqqət etdikdə, aydın olur ki, burada iqtisadiyyat əhalinin firəvan yaşayışına, sosial müdafiəsinin güclənməsinə, sosial-iqtisadi inkişafdan yararlanmaq imkanlarının genişlənməsinə istiqamətlənmişdir.

Bütün bunların nəticəsində iqtisadi proseslər ayrılıqda hər bir sakinin, bütövlükdə isə, bütün muxtar respublika əhalisinin sosial maraq və mənafelərinin ifadəsinə çevrilmiş, nəticə etibarı ilə təminat qabiliyyətli olmuşdur. Bunu hər bir nəfərə düşən ÜDM-nin həcmi də göstərməkdədir (şəkil 2).

Təhlillər göstərir ki, birinci Dövlət Proqramının icrası müddətində muxtar respublikada makroiqtisadi proseslər əhalinin maraq və mənafeyini dolğun şəkildə ifadə etməyi bacarmış və bu, özünü statistik göstəricilərin artan dinamikasında göstərməkdədir. Göründüyü kimi, ilk beşillik dövrdə hər bir nəfərədüşən ÜDM-nin həcmi 3,2 dəfədən çox artmışdır. Bu artım, 2004-2007-ci illərdə 2,3 dəfə, 2004-2006-cıillərdə 1,7 dəfədən çox, 2004-2005-ci illərdə isə 1,3 dəfə təşkil etmişdir.

**Şəkil 2.**
**Regional inkişaf üzrə Dövlət proqramlarının icrası dövrlərində Naxçıvan Muxtar Respublikasında hər bir nəfərə düşən ÜDM-nin həcmi (manat)**




Şəkil: Naxçıvan MR Dövlət Statistika Komitəsinin materialları əsasında müəllif tərəfindən hazırlanmışdır

Reallaşan səmərəli iqtisadi siyasət muxtar respublikanın makroiqtisadi gücünü daha etibarlı səviyyəyə yüksəltmişdir. 2006-cı ildə hər bir nəfərə düşən ÜDM-nin həcminin 1000 manatı, 2008-ci ildə isə 2000 manatı ötməsi muxtar respublikada qarşıya qoyulan məqsədlərə çatmaqda mühüm mərhələni keçildiyini göstərir. Eyni zamanda bu, əhalinin alıcılıq (tədiyyə) qabiliyyətinin yüksəldilməsini, onun sosial-iqtisadiinkişafdakı çevik iştirakını, milli quruculuq proseslərdə dövlətin ən güvənilir və ən etibarlı dəstəkçisiolmasına stimul verdiyini sübut edir.

İqtisadi inkişafın belə təşəkkülü hər bir sakinin və vətəndaşın maraq və mənafeyinin düzgün ifadə olunduğu potensialın yaranmasını sürətləndirməklə, ümumilikdə, iqtisadiyyatın sosiallaşma mahiyyətinin də yüksəlməsinə səbəb oldu. Elmi araşaıdrmalarda sosiallaşan iqtisadiyyat, əsasən, cəmiyyətin artmaqda olan tələbatının ifadə oluna bildiyi, insanların təhsilinin, sağlamlığının, dünyagörüşünün, mədəni ketfiyyətlərinin təmin olunduğu, ölkənin elmi-texniki inkişafı ilə müşayiət olunan iqtisadiyyatın səmərəlilik göstəricisidir (Hacızadə, 2006: 72).

Naxçıvan Muxtar Respublikası sosial-iqtisadi inkişafına qətiyyətlə və inamla davam edir. Göstərilən illər üzrə təşəkkül tapan göstəricilər ikinci beşilliyin də məhsuldar nəticələrlə tamamlandığını sübut etməkdədir. 2009-2013-cü illərdə belə nəticənin əldə olunması həm də birinci beşillik üzrə dayanıqlıbazanın olmasını bir daha göstərməkdədir. Həmçinin bu, qarşıdakı dövrlər üzrə iqtisadi perspektivliliyidaha da möhkəmləndirir və onun hədəflər üzrə səmərəliliyini daha da artırır.

Təhlillərimiz göstərir ki, 2009-2013-cü illər ərzində muxtar respublikada ÜDM-nin hər bir nəfərə düşən həcmi 2,2 dəfədən çox artmışdır. Dinamikanın 2009-2012-ci illər üzrə 2 dəfədən çox, 2009-2011-ci illər üzrə 1,8, 2009-2010-cu illər üzrə isə 1,2 dəfə olduğunu qeyd edə bilərik.

Məlumatlardan aydın olduğu kimi, 2011-ci ildə ÜDM-nin hər bir nəfərə düşən həcmi 4000 manatı, 2013-cü ildə isə 5000 manatı keçmişdir. Təbii ki, belə bir potensial muxtar respublika əhalisinin sosial rifahının daha da artmasına xidmət etmiş, onun iqtisadi təhlükəsizliyinə təminat yaratmış, milli iqtisadiyyat üçün hərəkətverici amilə çevrilmişdir.

Hesablamalar göstərir ki, 2014-2018-ci illəri əhatə edən dövrlər üzrə muxtar respublikada hır bir nəfərə düşən ÜDM-nin həcmi 1-1,2 dəfəyə yaxın artmışdır. Statistik rəqəmləri nəzərdən keçirərkən aydın olur ki, məqsədlərin qətiyyətli reallaşdırılması nəticəsində muxtar respublikada hər bir nəfərə düşən ÜDM-nin həcmi artıq 6000 manatı ötmüşdür ("Azərbaycan Respublikası regionlarının 2009-2013-cü illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı" nın təsdiq olunması haqqında Azərbaycan Respublikası Prezidentinin Fərmanı).

Üç mərhələdə uğurla icra olunan Dövlət proqramları bütün sahələr kimi iqtisadiyyatın aparıcı sahəsi olaraq, sənaye siyasətinin də məhsuldarlığını təmin etmiş və nəticədə milli iqtisadiyyatın perspektivləri üçün zəruri mərhələni başlatmış oldu. Məhz bu kimi amillərin təşəkkülü mühitində 2014-cü ilin "Sənaye ili" elan olunması Azərbaycan dövlətinin bu sahədəki məqsədilərinin reallaşmasında daha da qətiyyətliolduğunu bir daha sübut edirdi.

Ulu öndərin əsaslarını müəyyənləşdirdiyi müasir iqtisadi siyasət bütün sahələrin əlaqəli və stimullaşdırıcı inkişafı üçün sağlam mühitin təsisatlarını bərqərar etmiş, bu isə, sənayenin məhsuldar inkişafına yol açmışdır. 1995-ci ildən qətiyyətlə davam etdirilən bu siyasət muxtar respublikada müvafiq sahə üzrə perspektivlərin artmasına səbəb olmuşdur. Yaradılan güclü baza və həyata keçirilən səmərəli tənzimləmə siyasəti son 17 ilə yaxın dövrdə icrası davam etdirilən regional inkişaf proqramlarının məhsuldar nəticələri üçün əsas oldu (şəkil 3).

**Şəkil 3.**
**Regional inkişaf üzrə Dövlət proqramlarının icrası dövrlərində Naxçıvan Muxtar Respublikasında istehsal olunmuş sənaye məhsulunun həcmi (min manat)**




Şəkil: Naxçıvan MR Dövlət Statistika Komitəsinin materialları əsasında müəllif tərəfindən hazırlanmışdır.

İcrasına ilk beşillik üçün başlanan regionların sosial-iqtisadi inkişafına dair Dövlət Proqramları Naxçıvan Muxtar Respublikasında sənayenin davamlı inkişafı üçün səmərəli mühit yaratdı. Nəticədə müvafiq sahə üzrə məhsullar özünün dinamik artımına nail olmuş və əsas makroiqtisadi göstərici olan ÜDM-nin strukturunda ilk yerdə təşəkkül tapdı. Qeyd edək ki, sənaye bütün dövrlərdə iqtisadiyyatın aparıcı sahəsi olub, onun sahə strukturunun davamlı təşəkkülündə strateji əhəmiyyətə malikdir.

Təhlillərimiz göstərir ki, 2004-2008-ci illərdə muxtar respublikada sənaye məhsulunun həcmi 6,4dəfədən çox artmışdır. Bu, müvafiq olaraq:

2004-2007-ci illərdə 4,8 dəfədən çox;

2004-2006-cı ildə 2,8 dəfə;

2004-2005-ci illərdə isə 1,6 dəfədən çox təşkil etmişdir.

Ölkəmizdə qeyri-neft sektorunun inkişafının hədəf kimi götürülməsi Naxçıvan Muxtar Respublikasının da makroiqtisadi siyasətinin ən zəruri məqsədlərini təşkil etməklə, birinici dövlət proqramının icrası müddətində özünün səmərəliliyi ilə fərqlənmişdir. Şəklin məlumatlarından da göründüyü kimi, artıq 2007-ci ildə sənaye məhsulunun həcmi 100 milyon manatı ötüb keçmişdir.

İkinci Dövlət Proqramının nəticələrini təhlil edərkən aydın olur ki, istehsal olunan sənaye məhsulunun həcmində dinamik inkişaf özünü daha üstün səviyyədə göstərməkdədir. Burada sağlam iqtisadi mühitinvə etibarlı əmək şəraitinin mövcudluğu xüsusi əhəmiyyətə malik olması ilə seçilmişdir.

İlk olaraq onu qeyd edək ki, 2008-ci ildəki 100 milyon manatlıq sənaye məhsulu istehsalı artıq 2009- cu ildə 200 milyon manatı ötməklə davam etmişdir. Burada diqqəti çəkən ən mühüm inkişaf göstəricisi 2010-cu illə 2011-ci il arasında mümkün olmuşdur. Belə ki, müvafiq göstərici 2010-cu ildə 300 milyon manatı, 2011-ci ildə isə 600 milyon manatı ötmüşdür. Dinamik artım 2012-ci ildə 700 milyon manatdan, 2013-cü ildə isə 800 milyon manatdan artıq olmuşdur.

2009-2013-cü ildə muxtar respublikada istehsal olunan sənaye məhsulunun həcmi 4 dəfədən çox artmışdır. Bu, müvafiq olaraq:

2009-2012-ci illərdə 3,8 dəfə;

2009-2011-ci illərdə 3,2 dəfə;

2009-2010-cu illərdə isə 1,5 dəfə artmışdır.

Burada bir məqamı qeyd edək ki, ikinci Dövlət Proqramının icrası ərzində sənaye məhsulunun həcmindəki dinamik artım bir-birini əvəz edən digər illər üzrə 1-1,5 dəfə arasında dəyişirsə, bu, 2010-2011-ci illərdə 2,1 dəfə təşkil etməkdədir.

Artıq üçüncü Dövlət Proqramının icrası dövründə istehsal olunan sənaye məhsulunun həcmi 1,1 dəfə artmışdır. Artıq bu göstəricinin mövcud təşəkkülü onun 1 milyard manatı ötəcəyini deməyə əsas verməkdədir. Qeyd edək ki, hazırda muxtar respublikada istehsal olunan sənaye məhsulu ÜDM-nin 36faizə yaxınını təşkil etməkdədir.

Qeyd edək ki, sənaye məhsulunun həcminin dinamik olaraq artması iqtisadiyyatın sosialyönümlülüyünün də güclənməsinə stimul vermiş və bu, özünü hər bir nəfərə düşən sənaye məhsulunun həcmində göstərməkdədir (şəkil 4).

Təhlillər göstərir ki, 2004-2018-ci illərdə muxtar respublikada hər bir nəfər düşən sənaye məhsulununhəcmində 32 dəfəlik artım mümkün olmuşdur. Bu, 2004-2008-ci illərdə 6,1 dəfədən çox, 2004-2013-cü illərdə 29,3 dəfə təşkil etmişdir. Eyni zamanda, 2009-2013-cü illərdə bu artım 3,8 dəfəyə yaxın, 2014-2018-ci illərdə isə 1,1 dəfə artım olmuşdur.

**Şəkil 4.**

**Regional inkişaf üzrə Dövlət proqramlarının icrası dövrlərində Naxçıvan Muxtar Respublikasında hər bir nəfərə düşən sənaye məhsulunun həcmi (manat)**



Şəkil: Naxçıvan MR Dövlət Statistika Komitəsinin materialları əsasında müəllif tərəfindən hazırlanmışdır.

Bütün bunlar Naxçıvan Muxtar Respublikasının ötən illərdə keçdiyi davamlı və qətiyyətli sosial-iqtisadi inkişaf yolunu göstərməkdədir. Təbii ki, hər bir nailiyyət böyük ictimaiyyətin, xalqımızın və cəmiyyətimizin daim yüksək qiymətləndirdiyi ən mühüm gerçəklikdən ibarətdir. Fikrimizi əsaslandırmaq üçün qeyd edə bilərik ki, 2017-ci ildə Caspian Energy International Media Group iqtisadi islahatların və sosial siyasətin nəticələrini əks etdirən Azərbaycanın iqtisadi regionlarının illik investisiya reytinqini hazırlayıb. Orada böyük Heydər Əliyev ideyalarından bəhrlənən ölkənin uğurla icra etdiyi regionların sosial-iqtisadi inkişafına dair Dövlət Proqramlarına aid məqsəd və vəzifələrin əhəmiyyətinə istinad olunmuşdur. Burada Naxçıvan Muxtar Respublikasının formalaşdırdığı güclü infrastruktur potensialının əhəmiyyəti diqqətdə saxlanılmışdır.

Mahiyyət etibarı ilə, dövlətin sosial siyasəti üzvi surətdə uzlaşan aspektlərə (ideoloji, hüquqi, iqtisadi, mədəni, psixoloji, demoqrafik, etnik, təşkilati, regional, məkan və s.) malik olan mürəkkəb strukturlu, inteqral bir anlayışdır (Əliyev, Quliyev, 2005: 76) və bütün zamanlarda özünün aktuallığı ilə seçilməkdədir.

Qeyd olunanlar Azərbaycan Respublikasının təkcə regionda, Cənubi Qafqazda deyil, eyni zamanda, dünya miqyaslı nüfuz və mövqeyinin güclənməsində əlamətdar olmuşdur. Qeyd edək ki, müxtəlif vaxtlarda İsrailin, Yunanıstanın, Niderlandın, Belçika Krallığının, Türkiyənin, Rumıniyanın, İran İslam Respublikasının, Almaniyanın, Çin Xalq Respublikasının, Böyük Britaniya və Şimali İrlandiya Birləşmiş Krallığının və digər ölkələrin səfirlərinin Naxçıvan Muxtar Respublikasına səfərə gəlmələri, buradakı davamlı və perpsektivli sosial-iqtisadi inkişafın yaxından şahidi olmaları, çox mühüm strateji sahələrlə yanaşı alternativ və bərpa olunan enerji mənbələrinə, həmçinin innovasiya texnologiyalarının tətbiqinə və turizmin inkişafına göstərdiyi diqqətdən valeh olduqlarını bildirmələri də bunu bir daha sübut etməkdədir. Muxtar respublikada istehsalın daha da fasiləsiz təminatına səbəb olan infrastruktur təminatı etibarlılığı ilə seçilməkdədir. Bu, hər şeydən əvvəl, istehsal prosesi üçün yardımçı xarakter daşıyan istehsal və qeyri- istehsal sahələrinin kompleksidir. Başlıca olaraq, istehsal infrastrukturlarına nəqliyyat, enerji təchizatı və rabitə daxildir. Bununla yanaşı, təhsil, səhiyyə, yollar və s. - də infrastruktur sahələrinə aid olunur (Ağayev, 2005: 150).

Sözügedən Media Qrupunun bəyan etdiyi nəticələrlə tanış olarkən aydın olur ki, regionların qiymətləndirilməsində 18 parametr və 6 qrup üzrə təhlillər aparılmışdır. Bunlar:

-sosial-demoqrafik göstərici,
-sosial-iqtisadi vəziyyət,
-işgüzar mühit,
-infrastruktur,
-rifahlıq,
-kənd təsərrüfatı sahələrindən ibarət olmuşdur (7).

Qeyd olunanlar muxtar respublikanın dünəni ilə bugünün, bu günü ilə sabahının, eləcə də, sabahı ilə gələcəyinin səsləşməsində çox əlamətdar görünməkdədir. Muxtar respublikamızda həyata keçirilən tədbirlər öz məqsədyönlülüyü ilə seçilərək, yuxarıda müəyyən edilmiş qruplar üzrə dolğun xidmət etmişdir.

Bunlar, eyni zamanda, ölkənin regionları arasındakı sosial-iqtisadi inkişaf fərqinin aradan qaldırılmasını ifadə edən regional iqtisadi siyasətinin olduqca zəruri hissələrindəndir (Alıyev, İbadov, 1999: 122).

Təbii ki, bütün bunlar Naxçıvan Muxtar Respublikasında investisiya siyasətinin də səmərəliliyini göstərməkdədir. Belə ki, bu uğurlar özünü muxtar respublikada hər üç Dövlət Proqramının səmərəli icrası müddətində əsas kapitala yönəldilən investisiyaların həcmində göstərmişdir (şəkil 5).

**Şəkil 5.**

**Regional inkişaf üzrə Dövlət proqramlarının icrası üzrə müxtəlif illərdə Naxçıvan Muxtar Respublikasında əsas kapitala yönəldilən vəsaitlərin həcmi vəonlarda tikinti-quraşdırma işləri haqqında məlumat (min manat)**




Şəkil: Naxçıvan MR Dövlət Statistika Komitəsinin materialları əsasında müəllif tərəfindən hazırlanmışdır

Təhlillər göstərir ki, muxtar respublikada iqtisadiyyatın davamlı inkişafı çərçivəsində abadlaşdırma və müasir təminatlar sahəsindəki tədbirlər daha genişmiqyaslılığı ilə seçilməkdədir. Qeyd edək ki, 2004- 2007-ci illərdə həm əsas kapitala yönəldilən investisiyaların həcmində, həm də ondan tikinti-quraşdırma işlərində artım müşayiət olunmuş və bu, birincilər üzrə 2,8, ikincilər üzrə isə 2,5 dəfə mümkün olmuşdur.Sonrakı illər üzrə müvafiq olaraq:

2004-2011-ci illərdə 10,2 -10,3 dəfə;

2004-2014-cü illərdə 11,5 dəfədən-11,4 dəfədən çox;

2004-2016-cı illərdə 12,4 dəfədən-13 dəfədən çox;

2004-2018-ci illərdə isə 12,7 13,4 dəfədən çox artmışdır.

Beləliklə, Naxçıvan Muxtar Respublikasının müasir inkişaf mənzərəsinin təməlində müdrik ideyalardan bəhrələnən və uzunmüddətli dövrlər üçün xarakterik olan sosiallaşma prosesləri dayanmaqdadır. Bu isə təbii ki, milli iqtisadiyyat, onun şaxələndirilməsi və əhalinin güclü sosial qayğı ilə əhatə olunması üçün təmin edilməkdədir. Həmçinin bütün bunlar isə dövlətimizin iqtisadi gücünü və etibarlılığını ifadə edir ("Azərbaycan Respublikası regionlarının 2014-2018-ci illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı"nın təsdiq olunması haqqında Azərbaycan Respublikası Prezidentinin Fərmanı).

İqtisadi siyasətin səmərəli təşkili və idarə olunması iqtisadiyyatın digər aparıcı sahəsi olaraq, kənd təsərrüfatının mövcud potensialının daha da artırılmasını və uzunmüddətli perspektivlərə stimul verməsini təmin etmişdir. Regionların sosial-iqtisadi inkişafına dair Dövlət Proqramlarının təsdiq olunması bu amillərin ölkənin, onun regionlarının, o cümlədən, Naxçıvan Muxtar Respublikasında iqtisadiyyatın sahələri üzrə səmərəliliyini artırdı. Bunu hər üç mərhələdə kənd təsərrüfatı sahəsində məhsuldarlığın artandinamikası da sübut etməkdədir.

Təbii ki, bütün bunlar Naxçıvan Muxtar Respublikasının sosial-iqtisadi inkişaf mənzərəsinin ifadəsidir. Yuxarıda aparılan hər bir təhlil və araşdırma kənd təsərrüfatının iqtisadi artımdakı gücünü ortaya qoymaqdadır. Regionların sosial-iqtisadi inkişafına dair Dövlət Proqramlarının icrası müddətində kənd təsərrüfatı (aqrar sektor) bu potensialını daha da artırmış və ölkənin hədəf və prioritetlərinə dolğun cavab verməkdədir. 2004-2018-ci illərdə Naxçıvan Muxtar Respublikasının iqtisadiyyatında keyfiyyətcə yeni mərhələnin əsaslarını təşkil edən bu göstəricilər istehsal olunan kənd təsərrüfatının ümumi məhsulunda öz əksini tapmışdır (şəkil 6).

**Şəkil 6.**
**Regional inkişaf üzrə Dövlət proqramlarının icrası müddətlərində Naxçıvan Muxtar Respublikasında kənd təsərrüfatının ümumi məhsulu (faktiki mövcud qiymətlərlə, min manat)**




Şəkil: Naxçıvan MR Dövlət Statistika Komitəsinin materialları əsasında müəlliflər tərəfindən hazırlanmışdır

Göstərilən illər üzrə kənd təsəsrrüfatının ümumi məhsulunun artım dinamikasına diqqət edərkən aydınolur ki, 2004-2018-ci illərdə 6,2 dəfəlik artım olmuşdur. Həmin göstərici, 2004-2008-ci illərdə 2 dəfə,2009-2013-cü illərdə 1,8 dəfədən çox, 2014-2018-ci illərdə isə 1,4 dəfə təşkil etmişdir.

Aparılan təhlillər göstərir ki, istehsal olunan istehsal amillərini artırmaqla, yaxud texnika və texnologiyanı təkmilləşdirməklə adambaşına düşən ümumi milli məhsulu artırmaq, istehsal olunmuş olunmuş əmtəə və xidmətlərin kəmiyyətinin istehlak olunmuş əmtəə və xidmətlərin kəmiyyətindən çox olmasını ifadə edən iqtisadi artım Naxçıvan Muxtar Respublikasının yeni inkişaf mərhələsini təmin etməkdədir (İbadov, 2009: 373).

Milli iqtisadiyyat üzrə uzunmüddətli perspektivlərdən irəli gələn məqsədlər və vəzifələr müstəvisində qəbul olunan çoxistiqamətli tənzimləmə mexanizmləri sistemlilik və məqsədyönlülük mahiyyəti kəsbetmiş və ölkənin bütün regionları kimi Naxçıvan Muxtar Respublikasının da davamlı inkişafına istiqamətlənmişdir. Yüksək səmərəlilik göstəricilərinə malik olan Dövlət Proqramlarında muxtar respublikanın sosial-iqtisadi inkişafı üçün 2004-2008-ci illər üzrə 57 (2), 2009-2013-cü illər üzrə 46 (3),2014-2018-ci illər üzrə 57 (4) mərhələdə tədbir həyata keçirilmişdir.

Beləliklə, araşdırmalar bir daha göstərir ki, Naxçıvan Muxtar Respublikasının davamlı sosial-iqtisadi inkişafı regional Dövlət proqramlarının icra müddətində daha da etibarlılıq qazanmışdır. İqtisadiyyatınsahə strukturunun və regional tarazlığın çox mühüm hərəkətverici amili olaraq çıxış edən bu amil uzunmüddətli prioritetlər üçün əsas olmuşdur. Hazırda uğurla davam edən IV mərhələdə regional inkişafüzrə Dövlət proqramları keyfiyyətcə yeni mərhələ üçün güclü dayaqlar yaratmışdır.

## Nəticə

Naxçıvan Muxtar Respublikasının iqtisadiyyatında da istehsalın fasiləsizliyi ilə bağlı olan araşdırmalar bir daha onu göstərir ki:

- dayanıqlı makroiqtisadi inkişafyönümlü təsisatların yaradılmasında məqsədyönlülük mövcuddur;
- ÜDM-nin strukturunda etibarlı təşkilatlanma aparıcı sahələrin dinamik inkişafının real ifadəsini əksetdirməkdədir;
- kəndlərin iqtisadi inkişafı sahəsində proseslərin aktuallığının qorunması müvafiq tənzimləmə mexanizmlərinin reallaşan məqsədlərini təşkil etməkdədir;

- aqrar sektorda məşğulluq probleminin həllində əmək, maliyyə, təbii resurslardan istifadə sahəsindəəlçatanlıq mövcud olmaqdadır;
- xammal-emal-istehsal həlqəsinin etibarlılığında eyni zamanda, infrastruktur təminatının da roluböyükdür və s.

**Ədəbiyyat**


1. Qasımov, C. (2020).Naxçıvan Muxtar Respublikasının sosial-iqtisadi inkişafı regional Dövlət Proqramlarının icrası müstəvisində (2004-2018-ci illər). Naxçıvan: Əcəmi.
2. “Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı Dövlət Proqramı”nın (2004-2008-ci illər) təsdiq olunması haqqında Azərbaycan Respublikası Prezidentinin Fərmanı. 11 fevral 2004-cü il tarixdə ölkə başçısı tərəfindən təsdiq olunub.
3. Hacızadə, E. (2006). Sosiallaşan iqtisadiyyat. Bakı: Elm.
4. “Azərbaycan Respublikası regionlarının 2009-2013-cü illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı” nın təsdiq olunması haqqında Azərbaycan Respublikası Prezidentinin Fərmanı. 14 aprel 2009-cu il tarixdə ölkə başçısı tərəfindən təsdiq olunub.
5. Əliyev, A. Quliyev, A. (2005). Sosial sferanın iqtisadi və metodoloji əsasları. Bakı: Adiloğlu.
6. Ağayev, A. (2005). Maliyyə terminlərinin izahlı və tərcümə lüğəti. Bakı: Ziya.
7. https://news.day.az/azerinews/963578.html
8. Alıyev, İ., İbadov, S. (1999). Azərbaycan iqtisadiyyati. Bakı: Ağrıdağ.
9. “Azərbaycan Respublikası regionlarının 2014-2018-ci illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı”nın təsdiq olunması haqqında Azərbaycan Respublikası Prezidentinin Fərmanı. 27 fevral 2014-cü il tarixdə ölkə başçısı tərəfindən təsdiq olunub.
10. İbadov, S. (2009). İqtisadi nəzəriyyə. Dərslik. Bakı: Şərq-Qərb.


Göndərildi: 26.05.2022 Qəbul edildi: 12.07.2022

QƏDİM DİYAR Beynəlxalq onlayn elmi jurnal. İmpakt Faktor: 0.652. 2022 / Cild: 4 Sayı: 7 / 15-19 ISSN: 2706-6185
ANCIENT LAND International online scientific journal. Impact Factor: 0.652. 2022 / Volume: 4 Issue: 7 / 15-19 e-ISSN: 2709-4197

DOI: https://doi.org/10.36719/2706-6185/13/15-19

**Südabə Nəsrəddin qızı İsgəndərova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
pedaqogika üzrə fəlsəfə doktoru
sudaba.isgandarova@adpu.edu.az

# ELMİ MƏLUMATLAR ƏSASINDA TƏLƏBƏLƏR ARASINDA KONFORMAL DAVRANIŞIN TƏDQİQİ

**Xülasə**

Konformizm digər sosial proseslərdən fərqli olan, fərdin və qrupun qarşılıqlı fəaliyyəti zamanı yaranan xüsusi hadisədir. Burada qrupun təsiri altında uyğunluq yaranır və fərddə konform davranış baş verir. Beləliklə, konformizm sosial amildir, konform davranış isə psixoloji amildir. Konformizm hadisəsi zamanı şəxsiyyət qrupda üç mərhələdə komform davranışlar nümayiş etdirir: qavrama, dəyər və iş səviyyəsində.

Konformizmin təzahürünün fərdlər və qruplar arasında qarşılıqlı təsir proseslərinə müsbət təsirini artırmaq və onların mənfi nəticələrini aradan qaldırmaq üçün bu problemi araşdırmaq lazım olduğunu hiss etdik. Tədqiqat zamanı tələbələr arasında koqnitiv biliklərə əsaslanan konformal davranışla bağlı tədqiqatlar aparılmışdır. Eyni zamanda, şagirdlərin itaət səviyyəsi müəyyən edilmişdir.

***Açar sözlər:*** *konformizm, komformist davranış, sosial təzyiq, uyğunluq, qrup təzyiqi*

**Sudaba Nasraddin Isgandarova**
Azerbaijan State Pedagogical University
doctor of philosophy in pedagogy
sudaba.isgandarova@adpu.edu.az

## Investigation of conformal behavior with students on the basis of scientific data

**Abstract**

Conformism is a special phenomenon that differs from other social processes, arises during the interaction of the individual and group. Here, under the influence of the group, consistency is formed, and conformal behavior occurs in the individual. Conformism is a social factor, while conformism is a psychological factor. Personality in the group demonstrates comform behavior in three stages: perception, value and work level.

We felt the need to investigate this problem in order to increase the positive effect of the manifestation of knformism on the processes of interaction between individuals and groups and eliminate their negative consequences. During the study, studies were conducted on conformal behavior based on cognitive knowledge among students. At the same time, the level of obedience of students was determined.

***Keywords:*** *conformism, conformist behavior, social pressure, conformity, group pressure*

## Giriş

Cəmiyyətin inkişafının bütün mərhələlərində sosial reallıq kimi konformizm problemi mövcud olmuşdur. Nəyə görə başqa adamların davranış və tələblərinə uyğun olmaq üçün insanlar öz davranışlarını dəyişirlər. Bu sahədə insanların daxili motivlərinin və meyillərinin onların hərəkətlərinə təsiri öyrənilmişdir. Nəticələr göstərdi ki, konformizmə daha çox meyl göstərən insanlar sosial razılıqlara daha çox ehtiyac duyan insanlardır. Sonralar konformizmin şəxsi keyfiyyətlərdən asılılığını öyrənən tədqiqatçılar yalnız çox zəif korrelyasiya aşkar etdilər. Təsiri asanlıqla sübuta yetirilən situativ faktorlardan fərqli olaraq, insanların şəxsi keyfiyyətlərinin onların davranışlarına təsiri praktiki olaraq mümkün olmadı. Güclü sosial təzyiq olmadığı zaman şəxsi keyfiyyətlər davranışa daha çox təsir edir. Şəxsiyyət keyfiyyətlərinin konformizmə təsiri daha zəif sosial vəziyyətlərdə özünü daha güclü göstərir

(Sibilsky, Colleran, McElreath, Haun, 2021).

Konformist davranış fərdin mənsub olduğu cəmiyyətdə qəbul edilmiş davranış normalarını və qaydalarını ən asan mənimsəməsi ilə xarakterizə olunur. Bir insanın konformist davranışı çoxluğa qoşulmaq, onun dəyər yönümlərini qəbul etmək və öz istəklərindən imtina etmək mənasındadır.

Konformizm zamanı insanlar bir-birlərinə psixoloji təsir göstərir və bir-birlərinin davranışını istiqamətləndirirlər. Burada baş verən təsir vasitələri təlqin və təqliddir. Təqlid başqalarını olduğu kimi yamsılamaqla öyrənmədir, həmçinin dərk etmədən başqalarının davranışını olduğu kimi təkrar etməkdir.

Təlqin isə başqasının davranışında və düşüncələrində müəyyən dəyişiklikləri yaradan, dərk edilməyəntəsirdir (Bond, Smith, 1996).

Bir insanın uyğun davranışı və qrupun ona təsiri çox vaxt xarici və daxili amillərlə şərtlənr. Xariciamillərə qrupun birliyi, strukturu, fərd üçün əhəmiyyətli olan səlahiyyətlərin olması aid edilir. Daxili amillərə isə əsasən dünyagörüşü, təklif qabiliyyəti, münasibətlərinin formalaşması və tənqidi düşüncəniaid etmək olar.

Qrupdakı sosial təsir mənbələri fərqli olur. Konformizm insanların sosial statuslarəndan da təsirlənə bilər. Konformizm fəaliyyətin istiqamətinə, yəni qrup üzvlərinin qrupa qoşulmaq istəyi, qarşılıqlı fəaliyyətin xarakteri, nəzarət və rəylərin mövcudluğu, təsirlərin mövcudluğunun qavranılması və s. ilə şərtlənir, bundan asılı olaraq yaranır.

Sosial hadisə kimi konformizm sosial münasibətlərdə inkişafın təzahürlərini və xüsusiyyətlərini bilərək, ayrı-ayrı şəxslərin və qrupların müəyyən sosial-iqtisadi şəraitdə davranışının dəyişməsinin səbəblərini təhlil etməyə və izah etməyə imkan verir. Əsas məqsəd müasir cəmiyyətdə aktiv, sosial məsuliyyətli şəxsiyyətin formalaşması üçün düşünülmədən baş verən davranışın həyata keçirilməsinin və konformizmin mənfi nəticələrini qabaqcadan görmək və qarşısını almaqdır. Eyni zamanda, konformizm akademik biliklərin formalaşmasında, biliklərin düzgün anlaşılmasında sosial amil kimi böyük rol oynayır (Brewer, Roccas, 2001).

Konformizm və tabeçilik istisnasız olaraq bütün insanlara xas olan universal keyfiyyət olsa da müxtəlifmədəniyyətlərin nümayəndələrində sosial təsirlər fərqlidir.

Bəzən insanlar sosial təzyiqə fəal müqavimət göstərirlər və hərəkətlərinə görə məsuliyyət daşımırlar. Bu zaman insanlar öz azadlıqlarını və müstəqilliklərini qiymətləndirirlər və sosial təzyiq güclü olduqdaonların şəxsi azadlığına real təhlükə yarandığı üçün buna qarşı çıxırlar.

Çox zaman "konformizm" anlayışı mənaca yaxın olan digər anlayışlarla eyniləşdirilir. Sosial-psixologiyada “konformizm” və “sosial uyğunluq” anlayışları bir-birini əvəz edə bilər. V.E. Çudnovskiyə görə konformizm sosial hadisə, sosial uyğunluq isə insanın psixoloji xüsusiyyətidir (Çudovskiy,1992: 55). S.Milqram da uyğunluğu insan davranışının psixoloji mexanizm kimi göstərmişdir. A.V. Xolodovskaya görə isə bu anlayışlar insanın sosial həyatının dəyişən şərtlərinə uyğunlaşması kimi ortaya çıxır və bir-birinə əks tərəfdə olur. Sosial uyğunluq zamanı insanın özü ilə daxili razılığı olur, yəni onun inancları davranışlarına uyğun olur. Konformizmdə isə belə harmoniyaya rast gəlinmir. S.Milqram tədqiqat nəticələrinə əsasən konformizmdə bir sıra müddəalar təklif etmişdir:

1) Konformist davranışlar sosial təsir mənbələrinə görə fərqlənir: burada uyğunluq sosial təzyiqə cavabolaraq yaranır, konformizm isə fərd tərəfindən yalnız intuitiv şəkildə hiss olunur.

2) Konformizimdə təsir edən və təsir olunan müxtəlif sosial statusa malik olurlar: bu zaman insan sosial statusuna görə özünə bərabər hesab etdiyi və ya gələcəkdə mənsub olmaq istədiyi fərdlərə (qruplara) uyğun gəlməyə çalışır.

3)Hərəkətlərdə oriyentasiya baş verir: konformizmdə fərd özü qrupa can atır, onun bir hissəsi olmaq istəyir və bu zaman insanın davranışı onun könüllü seçiminin nəticəsidir.

4)Qarşılıqlı əlaqənin xarakteri fərqli olur: konformizm vəziyyətində fərdlə qrup arasındakı qarşılıqlı əlaqə ya birbaşa (birgə fəaliyyət, ünsiyyət və s.) və ya dolayı (biz bir-birindən uzaq olan qruplarında) ola bilər.

5)Nəzarət və əks əlaqənin olması: konformizm hətta qrupun insan davranışlarına nəzarət etmədiyi vəqarşısına belə bir məqsəd qoymadığı hallarda da özünü göstərir. Fərd müstəqil şəkildə “öz davranışını vəya münasibətini elə dəyişir ki, onlar qrupun davranışı və ya münasibəti ilə uyğun olsun, sanki, onunlarazılaşmaq istəyir.

6) Fərdin davranışının nəticəsi olur: konformizmlə "qrup üzvlərinin homogenləşməsi" vəziyyətini müşahidə etmək olar, hamı bərabər olduqda və oxşar hərəkətlərə başladıqda, fərd hamı ilə eyni olur.

7) Təzyiqin mövcudluğunun dərk edilməsi baş verir: konformizm şəraitində insanlar qrupa tabe olmaq istəklərini inkar edir, bu onların iradələrinin nəticəsi olaraq meydana çıxır. İtaətkarlıq halında, subyektlərdavranışlarının səbəbi kimi dərhal əmrlərin mövcudluğunu göstərdilər.

8) Konformizm hadisəsi cəmiyyətin təbiətindən asılı olaraq baş erir: uyğunluq, bir qayda olaraq, demokratik cəmiyyətdə özünü büruzə verir, eləcə də sosial nəzarət mənbəyi kimi çıxış edir (Çudovskiy, 1992: 41).

D.Mayers uyğunluğu konformizmin xarici forması hesab edirdi. İlk baxışdan anlayışlar həqiqətən dəoxşar görünə bilər, lakin onların mahiyyətini təhlil etdikdən sonra bəzi fərqləri qeyd etmək lazımdır.

1. Birincisi, sosial uyğunluq insanın psixoloji xüsusiyyətidir.

2. İkincisi, insan təzyiq altında olan qrupa təslim olur ki, bu da açıq və ya gizli inandırma, manipulyasiya və s. formalarda özünü göstərə bilər. Bu zaman ilkin hərəkət fərdə yönəlir, onun cavabı isə güzəştdir.

3. Üçüncüsü, insan onun kimi bir qrupa uyğunlaşmaq (konformizmin məqsədidir) məqsədi ilə deyil, münaqişədən qaçmaq və ya etibarlı məlumat əldə etmək üçün təslim olur.

Konformizmin xüsusiyyətlərini də vurğulamaq lazımdır: konformizm,ümumi fəaliyyət vəziyyətində, bir şəxs başqalarının məqsədləri ilə razılaşdıqda və onlara nail olmaq üçün necə davranacağını başa düşdükdə müşahidə olunur. Həyata keçirilməsi prioritet olan ümumi vəzifələr ön plana çəkilir. Fərd öz mövqeyini inkişaf etdirmədən yalnız hərəkətləri təkrarlayaraq, qrup üzvlərinin fikirlərini qəbul edərkən, razılaşa bilər. Arqumentasiyaya və məlumatın tənqidi qavrayışına əsaslanan fikirlərin şüurlu qəbulundan fərqli olaraq, konformizmin təzahürü çox vaxt bir insan tərəfindən tanınmır və sosial sanksiyaların tətbiqi qorxusu ilə əlaqəli duyğulara əsaslanır. İ.S.Kon vurğulayır ki, konformizm digər, "zahirən oxşar hadisələrdən fərqlənir: sosial inancların, dəyərlərin, vərdişlərin vahidliyi; "insanların qarşılıqlı əlaqəsini asanlaşdıran özünəməxsus sosial mexanizmlər" rolunu oynayan müxtəlif konvensiyaların, nəzakət qaydalarının və s. yerinə yetirilməsindən" (Maslou, 2009).

Konformizm qrupun təsiri ilə fərdin davranışının dəyişməsidir. Bu güzəşt şəklində və təsdiq şəklindəözünü göstərə bilər. Güzəşt şəklində daxili imtina zamanı qrupun tələblərinə riayət olunur. Təsdiq şəklində isə sosial təzyiq tələblərinin daxili razılıqla yerinə yetirilməsidir. Konformizmin bu cür təzahürləri bir sıra məqamlar doğurur. Birincisi, nə üçün çoxsaylı qruplarda fərdlərin böyük müxtəlifliyiolduğu halda, onların davranışı eynidir? Digər məqam konformizm həm müsbət, həm də mənfi hal ola bilməsidir. Onun mənfi təzahürləri, məsələn, kütlənin təsiri altında mənfi fikirlərin olmasıdır. Konformizmin müsbət təsiri ondan ibarət ola bilər ki, o, ictimai yerlərdə insanların yersiz davranışınınqarşısını alır (Merton, 2006).

Şimali Amerika və Avropa sosial psixoloqları daha çox müsbət (sosial həssaslıq, həssaslıq, əməkdaşlıqvə komandada işləmək bacarığı) deyil, belə tabeçiliyi (konformizm, güzəşt, tabeçilik) ifadə etmək üçünmənfi yollardan istifadə edirlər.

Konformizmin yaranmasına bir sıra amillər təsir göstərir. Knformizm "qrupun real və ya xəyali təzyiqi nəticəsində davranış və ya inancın dəyişməsi" deməkdir. Bəzən edilən işlərə həqiqətən inanmayaraq konformluq nümayiş olunur. Bəzən insanlar öz səriştəsizliyini hiss edirlər və ya onlardan hansısa mürəkkəb mülahizələr gözləyirlərsə konformallıq artacaq. Qrup üzvünün statusu nə qədər yüksək olarsa, onun digər üzvlərə təsiri bir o qədər güclü olar. İnformasiyanın da konformizmə təsiri böyükdür (Milqrem, 2000).

Cəmiyyətin əsas məqsədi sosial məsuliyyətli şəxsiyyətin formalaşması üçün düşünülmədən davranışın həyata keçirilməsinin mənfi nəticələrini qabaqcadan görmək və qarşısını almaqdır. Apardığımız tədqiqatın məqsədi biliklərin düzgün formalaşdırılmasında, akademik biliklərin mənimsənilməsində sosial amil kimi konformizmin rolunu müəyyənləşdirmək idi. Bu zaman tələbələr arasında koqnitiv biliklərə əsaslanan konformal davranış üzərində dayanılmışdır. Eyni zamanda, tələbələrin təqlid səviyyəsi müəyyən edilmişdir. Bunun üçün Azərbaycan Dövlət Pedaqoji Universitetinin "Korreksiyaedici təlimin metodikası və metodologiyası" ixtisası üzrə birinci kurs magistrantları arasında riyazi əməliyyatlardan ibarət misalı yerinə yetirərkən konfotmizmin baş verməsini müəyyən etməyə çalışdıq. Eksperimentdə 8tələbə iştirak edirdi. 2 nəfərdən ibarət düzəltmə qrup təşkil olundu. Digər tələbələr isə sadəlövh subyektkimi seçildi. Tələbələrə aşağıdakı misalın həll olunması tələb olundu (Rozenberq, 2014: 31):

17-1(6-6) :0. Qeyd edim ki, tədqiqat humanitar fənn müəllimi tərəfindən həyata keçirildi.

Digər eksperiment isə ADPU-da Korreksiyaedici təlim ixtisasında ikinci kurs tələbələri ilə keçirildi. Esperimemtdə 11 və 30 nəfərdən ibarət tələbə iştirak edirdi və "Sağlamllıq imkanları məhdud uşaqların somatik və klinik xüsusiyyətləri" fənnində keçirildi, dərsin mövzusuna uyğun sual hazırlandı. Bu eksperiment zamanı da hər qrup üçün 1 nəfərdən ibarət düzəltmə qrup təşkil edildi, tələbələrdən biri qrupun lider, digəri isə daha sosial əlaqələri və akademik bilikləri zəif tələbə idi. Sual belə qoyuldu: baş beyin qabığının assosasiyası qanununa görə insanın sağ tərəfi beynin sol hissəsi, bədənin sol tərəfi isə beynin sağ hissəsi ilə tənzimlənir. Bu qanunauygunluğu bütün orqanlara aid etmək olarmı?". Düzgün cavab əvvəlcədən düzəltmə qrupda iştirak edən 2 nəfərə başa salındı. Bu qanunauyğunluq bütün orqanlara aid deyil, ancaq duyğu orqanlarına və hərəkət orqanlarına aiddir, daxili orqanlara isə aid deyil. Çünki daxili orqanların fəaliyyəti qeyri-iradi tənzimlənir. Beyin qabığı isə iradi hərəkətləri tənzimləyir." Lakin düzəltmə qrupu təşkil edən tələbələrə tapşırıldı ki, yaxşı oxuyan tələbə səhv fikir desin və əsaslandırsın: Bu qanunauyğunluq bütün orqanlara aiddir. Beynin strukturuna əsasən baş beyin qabığı və baş beyin şöbələri bu qanunauyğunluğa tabedir." Digər tələbə isə düzgün fikri deyib əsaslandırmalı idi. Dərsin əvvəlində tələbələrə sual verildi. 11 tələbə düzgün, 30 tələbə isə səhv cavab verdi. Bundan sonra əvvəlcə yaxşı oxuyan tələbə səhv cavabı, sonra isə zəif oxuyan tələbə isə düzgün cavabı izah etdi. Tələbələrin bəziləri öz fikrində qaldı, bəziləri fikrini dəyişdi. Onlardan əksəriyyəti səhv fikir olsa da yaxşı oxuyan tələbənin fikirlərini dəstəklədi. Bu da həmin tələbənin qrupda statusu ilə bağlı idi. Nəticələr aşağıdakı cədvəllərdə öz əksini tapmışdır (Xolodovskaya, 2009: 21).

Düzəltmə qrup üzvlərinin miqdarı dəyişildikdə şəxsin yol verdiyi səhvlərin miqdarı

| **Qruplar** | **Sınanan şəxslərin Miqdarı** | **Düzəltmə qrup üzvlərinin miqdarı** | **Səhvlərin orta miqdarı** |
|---|---|---|---|
| Eksperimental | 30 | 1 | 4 - 13% |
| | 11 | 1 | 1 – 9,09 % |
| | 8 | 2 | 1-12,5% |

S.Aş konform davranışın 3 səviyyəsinə uyğun olaraq tələbələrin konform davranışları müəyyənləşdirildi. S.Aş konform davranışın səviyyələrini belə qeyd etmişdir:

1. Qavrayış səviyyəsində qrup təzyiqinə tabe olma; Bu zaman sınanılan şəxs qrupun təsiri altındaobyekti təhrif olunmuş formada qavrayır.
2. Qiymət səviyyəsində qrup təzyiqinə tabe olma; Bu zaman qrupun haqlı olduğunu hesab edir.
3. İş səviyyəsində qrup təzyiqinə tabe olma; Konfliktə girməmək üçün qrupla razılaşırlar (Bayramov,2003: 170).

Deyilənlərə əsasən qrup təzyiqinə tabe olma səviyyəsinə görə konformist davranış nümayiş etdirəntələbələrin sayı qeyd olnmuşdur:

| **Səviyyələr say** | **Qavrayış səviyyəsində qrup təzyiqinə tabe olma** | **Qiymət səviyyəsində qrup təzyiqinə tabe olma** | **İş səviyyəsində qrup təzyiqinə tabe olma** |
|---|---|---|---|
| 4 | 3 | 1 | |
| 1 | | | |
| 1 (riyaziyyat) | | | 1 |

Eyni zamanda "Düzəltmə qrupun" təsiri altında "sınanılan şəxslərin" təlqinə qapılma dərəcəsi müəyyənləşdirildi. Əsasən təlqinə qapılma 3 dərəcədə özünü göstərir:

1.Asanlıqla təlqinə qapılanlar - hipersuqqestiv tip;
2.Orta səviyyəli təlqinə qapılanlarn - Suqqestiv tip;
3.Çətinliklə təlqinə qapılanlar - Hiposuqqestiv tip.

Eksperiment zamanıqrup təzyiqinə məruz qalan tələbələrin təlqinə qapılması da kəmiyyət və keyfiyyət baxımından qiymətləndirildi:

| **Təlqinə qap Cəmi** | **Hipersuqqestiv** | **Suqqestiv** | **Posuqqestiv** |
|---|---|---|---|
| 4 | 2 | 1 | 1 |
| 1 | | | 1 |
| 1 (riyaziyyat) | | 1 | |

Cədvəldə düz (1) və səhv (4) cavab verənlər ayrı qrup kimi, digəri isə riyaziyyat qrupu olaraq qeyd edilərək, onların təlqinə qapılma səviyyələri göstərilmişdir.

## Nəticə

Beləliklə, qrupda akademik biliklərin formalaşması zamanı konformist davranışın öyrənilməsi zamanı müəyyən olundu ki, tələbələr arasında qrup təzyiqiqinə məruz qalan tələbələrin sayı 9 və 13% arasında dəyşir. Müəyyən olundu ki, tələbələr qavrayış, qiymət və konfliktə girməmək səbəbindən hipersuqqestiv, suqqestiv və hiposuqqestiv səviyyədə qrup təzyiqinə tabe olurlar.

## Ədəbiyyat

1. Sibilsky, A., Colleran, H., McElreath, R., Haun, D. (2021). Conformity decreases throughout middle childhood among ni-Vanuatu children: An intracultural comparison. Developmental Psychology, 1497-1509, PsycInfo Database Record (c) APA. https://doi.org/10.1037/dev 0001234.
2. Bond, R., Smith, P. (1996). Culture and conformity: A meta-analysis of studies using asch's (1952b, 1956) line judgment task, Psychological Bulletin.
3. Brewer, M., Roccas, S. (2001). Individual, self, relational self, collective self, Psychology Press, Chapter Individual Values, Social Identity, and Optimal Distinctiveness.
4. Chudnovskiy, V. (1992). Moral stability of the individual. Norm.
5. Maslou, A. (2009). Motivasiya i lichnost. Spb: Piter.
6. Merton, P. (2006). Sosialnaya teoriya isosialnaya struktura. Moskva: AST.
7. Milqrem, S. (2000). Eksperiment v sosialnoy psixoloqii. SPb. Piter.
8. Rozenberq, H. (2014). Konformizm kak sosialnıy fenomen. Obshestvennıe nauki. №3, 31 s.
9. Xolodovskaya, A. (2009). Nekotorıe sosialno-psixologicheskie mexanizmı formirovaniya konformizma. Vestnik Bryanskoqo gosudarstvennovo texncheskogo universiteta. № 1, 21 s.
10. Bayramov, O., Əlizadə, A. (2003). Sosyal Psikoloji. Dərslik. Bakı GAP-Yalan makinesi.

Göndərildi: 30.04.2022 Qəbul edildi: 01.07.2022

DOI: https://doi.org/10.36719/2706-6185/13/20-25

**Rəşad Razik oğlu Seyidov**
Ərzurum Atatürk Universiteti
doktorant
resadseyidov373@gmail.com

# ƏRƏB-MƏHCƏR ƏDƏBİYYATI VƏ ONUN TƏDQİQİ MƏSƏLƏLƏRİ

**Xülasə**

Məqalədə ərəb-məhcər ədəbiyyatının tədqiqi məsələləri tədqiqat predmetinə çevrilir. "Qələmlər birliyi" ədəbi cəmiyyətinin təşkili yeni ərəb ədəbiyyatı və mədəniyyətinin yaradılmasında o zaman aparıcı rol oynayan yeni, görkəmli ədəbi məktəbin təşəkkülündən xəbər verirdi. Mixail Nüaymənin, Cübran Xəlil Cübranın, İlya Əbu Madinin, Nəsib Əridənin, Rəşid Eyyubun, Əbd əl-Məsih Həddad və başqalarının aktiv fəaliyyət göstərdikləri bu təşkilat yeni ərəb ədəbiyyatı tarixində bütöv bir mərhələ təşkil etmiş, onun sonrakı inkişafım əhəmiyyətli dərəcədə müəyyən etmişdir.

Mövzuların yeniləşdirilməsi, real gerçəkliyə müraciət edilməsi, müasir dövrün aktual problemlərininbədii surətlərdə təcəssüm etdirilməsi - bütün bunlar "Qələmlər birliyi"nə daxil olan yazıçılar üçün həyati tələbat idi. "Qələmlər birliyi"nin üzvləri ərəb poeziyasının ənənəvi qaydalarına da yenilik gətirdilər. Mühacir şairlər ərəb ədəbiyyatında yeni janr - mənsur şeir janrını yaratdılar. Mühacir yazıçılar nəsrintəsvir vasitələrini yeniləşdirdilər.

***Açar sözlər:*** *Ərəb-məhcər, ədəbiyyat, tədqiqat, şair, "Qələmlər birliyi" cəmiyyəti*

**Rashad Razik Seyidov**
Erzurum Atatürk University
PhD student
resadseyidov373@gmail.com

## Arabic-muhjar literature and its research issues

**Abstract**

In the article, the issues of the study of Arabic-Mahjar literature become the subject of research. Theorganization of the "Union of Pens" literary society signaled the formation of a new, outstanding literaryschool that played a leading role in the creation of new Arabic literature and culture at that time. This organization, in which Mikhail Nuayma, Jubran Khalil Jubra, Ilya Abu Madi, Nasib Arida, Rashid Eyyub,Abd al-Masih Haddad and others were active, formed a whole stage in the history of new Arabic literatureand determined its subsequent development to a significant extent.

Renewal of topics, appeal to real reality, embodiment of the actual problems of the modern era in artistic images - all these were vital requirements for the writers who joined the "Union of Pens". Members of the "Union of Pens" also brought innovation to the traditional rules of Arabic poetry. Immigrant poets created a new genre in Arabic literature - the genre of mansur poetry. Immigrant writers innovated themeans of describing prose.

***Keywords:*** *Arabic-muhjar, literature, research, poet, "Union of Pens" society*

## Giriş

Məşhur alman şərqşünası K.Brokelman ərəb ədəbiyyatı tarixinə həsr etdiyi tədqiqatında yazırdı ki, ərəblərin Amerikaya birinci mühacirəti XVII əsrin ikinci yarısından etibarən müşahidə olunur. 1660-cı ildə mosullu ruhani İlyas ibn Hanna birinci olaraq Amerikaya gəlmişdir. O, geri qayıdandan sonra Yeni Dünyaya güclü mühacirət başlandı. Akademik İ.Y.Kraçkovski də yazırdı: "XX əsrin əvvəllərində Amerika Birləşmiş Ştatlarının və Braziliyanın iri mərkəzlərində sayı 300 mindən 500 minə çatan xeylisayda ərəb koloniyaları - məhəllələri qruplaşmaqda idi" (Braginsky, 2009: 290).

Ərəb tarixçiləri mühacirətin səbəblərini qiymətləndirmək məsələsində müxtəlif fikirlər söyləyirlər. Bəziləri bunu iqtisadi amillərlə və əhalinin sayının çoxalması ilə izah edir, digər tədqiqatçılar

siyasi səbəbləri təqdim edirlər:Osmanlı imperiyasının hökmranlığı dövründə ölkənin asılı vəziyyəti, Əbdülhəmid rejiminin repressiya siyasəti, xristianların təqib olunması və s. Görünür, hər iki amil həlledici rol oynamışdır. XIX əsrin əvvəllərində II Bəşir əş Şihabinin hökmranlığı dövründə Livandan müəyyən miqdarda maronitlər Fələstinə, Ermənistana, Orta Asiyaya və Kiprə mühacirət etdilər. 60-cı illərdən sonra mühacirət kütləvi xarakter almağa başladı.

Livanlıların yollandığı ilk ölkə Misir idi. Ərəb Şərqinin bu mədəniyyət mərkəzində Livandan olan istedadlı yazıçı və jur-nalistlər yaşamaq və yaratmaq imkanı əldə etdilər. Livanlı yazıçı, dramaturq, novellaçı və şairlər qrupunun - Ədib İshaq, Səlim əl-Nəqqaş, Nəcib Həddad, Circi Zeydan, Fərəh Antun, Labibə Həşim, Tannus Əl-Huri, Cübran Xəlil və başqalarının buraya gəlişi ilə ərəb ədəbiyyatında novatorluq məktəbinin başlanğıcı qoyuldu. Bu məktəbi livanlı mühacirlər mütərəqqi fikirli Misir yazıçıları ilə birlikdə yaratdılar (Gibb, 2005: 78).

Livanlı ədiblərin bir çoxu o dövrdə Misirdə indinin özündə də məşhur olan qəzet və jurnalları təsis etdilər. Bu mətbu orqanlar tezliklə geniş oxucu dairəsinin və ədəbiyyatı sevənlərin rəğbətini qazandı. Məsələn, Səlim paşa Həməvi “əl-Kavkab əş- şərqi” (“Şərq ulduzu”, İskəndəriyyə, 1872), Bişara Təklə Misirin ən iri qəzetlərindən biri olan “əl-Əhram”ı (“Ehramlar”, İskəndəriyyə, 1876), Ədib İshaq və Səlim ən-Nəqqaş “əl-Məhnı- sa” (“Qahirə”, Qahirə, 1879) qəzetini, Yaqub Sərruf və Fariz Nimər “əl-Məttətəf ’ jumalını (“Məcmuə”, Qahirə, 1885) və “əl-Mükəttəm’" qəzetini (Qahirə, 1889), Circi Zeydan bu günə qədər məşhur olan “əl-Hilal” (“Aypara”, Qahirə, 1892) və s. buraxırdılar. Bu dövri nəşrlərdə çıxış edən livanlı ədiblər öz estetik görüşlərini azad şəkildə ifadə etmək və ədəbi durğunluğu tənqid etməklə yanaşı, həm də Osmanlı imperiyasının əsarəti əleyhinə öz siyasi mövqelərini müdafiə etmək imkanı əldə edirdilər.

Livan ilk şərq ölkələrindən idi ki, buraya Qərbdən dini, daha çox isə siyasi məqsədlərini güdən missionerlər axışıb gəlirdi. Eyni zamanda bu missionerlər ölkənin maariflənməsində də müəyyən roloynayırdılar. Bir sıra ali və orta təhsil müəssisələri yaradılır, bu müəssisələrdə təhsil proqramları müasir tələblər əsasında tərtib olunurdu. Yeni dərsliklərin hazırlanmasında Şeyx Nasif əl-Yazıçı, Butrus əl- Bustani və s. kimi məşhur yazıçılar iştirak edirdilər. Xəstəxanalar, nəşriyyatlar açılmış, müxtəlif xeyriyyəcəmiyyətləri, kolleclər təsis edilmişdir. 1866-cı ildə Beyrutda əsası qoyulmuş Amerika Universiteti dahaçox şöhrət qazanmışdı.

Missionerlər özlərinin apardığı maarifçilik işi sayəsində livanlıların rəğbətini qazana bilmişdilər. Qərblə iqtisadi və mədəni əlaqələrin möhkəmləndirilməsi, Avropa ədəbiyyatının ərəb dilinə tərcüməsi Qərb həyat tərzinin təbliğini və Qərbə mühacirət ideyasının cazibəsini qüvvətləndirirdi (Dolinina, 2001: 56).

Çiçəklənən Yeni Dünya haqqında missionerlərin hekayələrini eşidən ərəblər Amerikaya “qızıl mədəni” kimi baxırdılar. Lakin buraya gələndən sonra onlar çox ağır vəziyyətə düşür, Nyu-Yorkun ən yoxsul kvartallannda məskunlaşmağa, ailələrini dolandırmaq üçün gecə-gündüz əziyyət çəkməyə məcbur olurdular. Onların çoxu qısa müddətdən sonra müflis vəziyyətdə vətənə qayıtmalı olurdular. Mühacir ərəblər öz vətənlərində baş verən siyasi, ictimai, mədəni hadisələrə böyük maraq göstərir, öz ənənələrini və dillərini qoruyub saxlamağa çalışır, daha sıx birləşmək üçün qəzet və jurnallar təsis edirdilər. 1907-ci ildə Nyu-York şəhərində “suriyalılann birləşmiş cəmiyyəti” (“Cəmiyyə əs-Suriyyun əl-müttəhida”) təşkil olunmuşdu, 1908-ci ildə “Suriya-Amerika klubu” (“əl-Müntidi əs-Suri əl-Əmriki”) açıldı. 1924-cü ildə cəmiyyət və klub “Suriya-Amerika federasiyası” adı altında birləşdi (“Müəssəsə əs-Suriyyun əl- Əmrikuyyin”) (Al-Kayali, 2011:89).

1911-ci ildə Nyu-Yorkda “Livanın tərəqqisi liqası” (“Usba ət-təkaddüm əl-Lübnani”) yarandı. Onun sədri Naum Mukarzan idi. Liqa Birləşmiş Ştatlarda və Kanadada məskunlaşan livanlıların siyasi həyatında fəal iştirak edirdi. Onun üzvləri öz vətənlərinin Osmanlı imperiyasının əsarətindən azad etməkuğrunda mübarizə aparır, ölkələrinin mədəni inkişafı üçün maliyyə vəsaiti toplayırdılar.

Dini, maarifçi ideyaları təbliğ edən və xeyriyyəçiliklə məşğul olan çoxsaylı təşkilatlar yaradılmış-dı. Onlardan ən məşhuru “Suriya maarifçilik cəmiyyəti” “əl-cəmiyyə əs-Suriyya ət-təlimiyyə”) idi. Bu cəmiyyət 1916-cı ildə Nyu-York şəhərində təsis olunmuşdu və Amerikanın ali məktəblərində təhsil alan su- riyalı tələbələrə yardım etməklə məşğul olurdu. Onun üzvləri öz həmyerliləri üçün pulsuz mühazirələroxuyur, dərsliklər yazırdılar. Tədricən ərəb ədibləri, alim və rəssamları məşhurlaşmağa başlayırdılar. Ədəbiyyat və jurnalistika sahəsində Cübran Xəlil Cürbran, Əmin ər-Reyhani, Mixail Nüaymə, Rəşid Əyyub, Fövzi əl-Məaluf, Şəfiq əl-Məaluf, İlya Əbu Mada, incəsənət sahəsində Hanna Qənim, Fuad Səabavə başqaları müvəffəqiyyətlə çalışırdılar.

1892-ci ildə Nyu-Yorkda İbrahim və Nəcib Ərbili qardaşlarının təsis etdiyi "Kaukab Əmrikə" ("Amerikanın ulduzu") adlı ilk həftəlik ərəb qəzeti nəşr olunmağa başladı (46; 51). Bu qəzet hər gün iki dildə - ingilis və ərəb dillərində çap olunurdu. Qəzet özünün başlıca vəzifəsini - ərəbləri Qərbin həyat tərzi, Amerika oxucusunu isə ərəblərin məişəti və ərəb gerçəkliyi ilə tanış etməkdə görürdü. Qəzet, həmçinin Amerika "azadlığı", Yeni Dünya haqqında təbliğatçılıq məqsədi ilə təhrif olunmuş, yalançı məlumatları da təkzib edirdi. 1907-ci ildə Nəcib Ərbili- nin vəfatından sonra onun qardaşı İbrahim Ərbili qəzetin nəşrini davam etdirdi. "Kaukab Əmrikə" 1909-cu ilə qədər çap olundu.

1898-ci ildə Naum Mukafzal Filadelfıyada "Çəridə əl-Xu- da" ("Doğru yol") (119, 72) qəzetini təsis etdi. Bu qəzetin çoxlu bölmələri (ədəbi, informasiya, elan, faydalı məsləhətlər və s.) var idi. Qəzet ərəb ölkələrində, xüsusilə də Suriyada çox böyük şöhrət qazanmışdı. N.Mukarzalın vəfatından sonra onun işini qardaşı Səlim Nukarzal davam etdirdi. O, bir neçə qəzet və jurnalın, o cümlədən "Bərid Əmrikə" ("Amerikanın poçtu", 1907) və "əl-Aləm əl-cədid" ("Yeni dünya",1918) qəzetlərinin naşiri idi (Konrad, 2006: 54).

Geniş yayılmış mühacir nəşrlərindən biri də "Mirət əl- qarb" ("Qərbin güzgüsü") (119,74) qəzeti idi. Qəzet 1899-cu ildə Nəcib Musa Diyab tərəfindən təsis edilmişdi. 1912-ci ildə Əbd-əl Məsih-Həddad Nyu- Yorkda "əs-Saih ("Səyahətçi") qəzetini çap etdirməyə başlayır. Onun səhifələrində tez-tez "Qələmlər birliyi"nin üzvlərinin imzası ilə elmi, siyasi, ədəbi məqalələr çap olunurdu. Qəzet həftədə iki dəfə çıxırdı. Ə.M.Həddad burada öz ədib həmkarlarının əməkdaşlıq etməsi üçün hər cür şərait yaratmışdı. Bütün bunların sayəsində "əs- Saih" mühacirətdə ərəb ədiblərinin ən başlıca mətbu orqanına çevrildi.

1913-cü ildə Nəsib Əridə tərəfindən əsası qoyulmuş "əl-Fü- nun" ("İncəsənət) (146, 51) jurnalı bütünmühacir nəşrləri arasında ən məşhuru idi. Jurnal I Dünya Müharibəsinə qədər çap olunmuşdur. M.Nüaymənin sözlərinə görə, "bu, səhifələrində həqiqi tənqidin çap oluna bildiyi yeganə jurnal idi. Bu jurnalın səhifələrində ilk dəfə ərəb yazıçılan ərəb ədəbiyyatı və dilçiliyində durğunluğa qarşı çıxış etməyə başladılar". Burada demək olar ki, bütün mühacir ərəb yazıçılannın əsərləri çap olunurdu.

1929-cu ildə Nyu-Yorkda İlya Əbu Mada "əs-Samir" ("Həmsöhbət") jurnalının birinci nömrəsini buraxdı. Burada əsas yer bədii əsərlərə aynlırdı, lakin arabir ictimai-siyasi mövzulara da yer verilirdi. Məşhur ərəb tarixçisi Filip Tə razi qeyd edirdi ki, "əs-Samir" Yeni Dünyada ərəb mühacirlərinin əhəmiyyətli mətbu nəşrlərindən idi". Jurnalın birinci nömrəsi Əbu Madanın "İlk söz, yaxud "əs-Samirinsöhbəti" ("əl-Kəlimə əl-ülə əv-hədis əs-Samir") məqaləsi ilə açılırdı ki, müəllif burada yazırdı: "Biz mətbuatda fəal əməkdaşlıq etməliyik ki, özümüzün hər bir gününü vətənə, millətə və doğma dilimizəxidmət etməyə həsr edə bilək" (Dolinina, 2003:43).

Yuxarıda adı sadalanan bütün qəzet və jurnallar Nyu-Yorkda çap olunurdu. Ərəb mühacirlərinin mətbuorqanları Birləşmiş Ştatların başqa şəhərlərində də nəşr edilirdi. Artıq XX əsrin I yarısında Amerika Birləşmiş Ştatlarında, Kanada və Meksikada otuza yaxın ərəb qəzeti və jurnalı çap olunurdu. Maddi çətinliklərə baxmayaraq, onların təsisçiləri öz fəaliyyətlərini dayandırmırdılar. Ərəb məhcər mətbuatı Qərbdəki həyat barədə gəlmə ərəbi Yeni Dünyada (ABŞ-da) gözləyən sınaq və əziyyətlər haqqında həqiqətləri oxuculara çatdırırdı. Eyni zamanda bu mətbuat ingilisdilli nəşrlərində Qərb oxucusunu ƏrəbŞərqi ilə tanış edir və beləliklə də, öz vətənləri ilə Qərb arasında mədəni əlaqələrin möhkəmlənməsi üçün müəyyən işlər görürdü. Ə.ər-Reyhaninin, C.X.Cübranın M.Nüaymənin adları həm Amerikada, həm dəƏrəb Şərqində geniş yayılmışdı.

Birinci Dünya Müharibəsindən sonra bir sıra mühacir qəzet və jurnalların nəşri dayandı. Bunun ilkin səbəbi, Suriya və Livanın Osmanlı imperiyası əsarətindən azad olunması və bir sıra mühacirlərin vətənə qayıtmaq imkanı əldə etmələri, digər səbəbi isə bir çox mühacirlərin ağır maddi vəziyyəti ilə izah olunurdu. Amerikada yaşayan ərəb yazıçılan isə hansısa yollarla öz ədəbi fəaliyyətlərini davam etdirirdilər.

Dövri mətbuatda Ə.ər-Reyhaninin, C.X.Cübranın, eləcə də o vaxt hələlik az tanınmış müəlliflərdənİlya Əbu Madanın, Nəsib Əridənin və başqalannın əsərləri, hekayə və mənsur şeirləri çap olunurdu. Vətənpərvərlik ruhunda yazılan bu bədii əsərlər sabit oxucu rəğbətini qazanmışdı.

Əmin ər-Reyhani tezliklə vətənə qayıtdı. Burada o, ərəb dili və ədəbiyyatının tarixinin öyrənilməsi ilə ciddi məşğul olmağa başladı. Qürbətdə yaşanmış illər hədər getməmişdi. O, Qərb "sivilizasiya"sının mahiyyətini dərindən anlayır, özünün oçerk, hekayə və şeirlərində kapitalizmin yırtıcı mahiyyətini inandırıcı şəkildə ifşa edirdi. Yazıçının rəğbəti həmişə sadə zəhmətkeşlər tərəfində olurdu.

Birinci Dünya Müharibəsinin başlanğıcında "əl-Fünun" jurnalı və ərəb mühacirlərinin digər mətbu orqanları bağlandı. "Əl-Fünun" 1916-cı ildə öz fəaliyyətini bərpa etdi. Lakin tezliklə maddi çətinliklər üzündən onun nəşri birdəfəlik dayandırıldı. Nəticədə, ərəb ədibləri "əs-Saih" qəzeti

ətrafında daha sıxbirləşdilər.

1920-ci il aprelin 28-də onlar öz təşkilatlarını yaratdılar və onu "Qələmlər birliyi" adlandırdılar. Buraya Cübran Xəlil Cübran, Mixail Nüaymə, Uilyam Kətisflayis, Əbd-əl Məsih Həd- dad, Nədra Həddad, İlyas Atallah, Nəsib Əridə, Rəşid Əyyub üzv oldular. Cəmiyyətin sədri Cübran Xəlil Cübran, katibi isə Mixail Nüaymə seçildi. Onlar özlərinin mətbu orqanını çap etdirmək qərarına gəldilər. Bununla belə, "Qələmlər birliyi"nin üzvlərinin maddi vəziyyəti o qədər ağır idi ki, onlar birliyin "Məcmuəyə ər-Rabitə əl-kaləmiyyə" adı ilə işıq üzü görən məcmuəsindən cəmi bir almanax çap etdirə bildilər. Burada "Qələmlər bir!iyi"nin üzvlərinin, eləcə də digər ərəb yazıçılarının əsərləri, xarici müəlliflərin yaradıcılığından tərcümələr nəşr olundu. Birlik o qədər imkansız idi ki, özünün ədiblərin pulla mükafatlandırılmasına dair qəbul etdiyi qəranni belə yerinə yetirə bilmədi.

"Qələmlər birliyi"nin əsas mətbu orqanı "əs-Saih" qəzeti idi. Onun fəaliyyəti haqqında M.Nüaymə belə yazırdı: "əs-Saih" bizim carçımız, onun redaksiyası bizim Məkkəmiz, fikirlərimizin xitabət kürsüsü, şeirlərimizin "Ukkəzi, komediyalarımızın göstərildiyi səhnə idi". Qəzetdə "Qələmlər birliyi" üzvlərininəsərləri, əcnəbi yazıçıların əsərlərindən tərcümələr çap olunurdu. Onun naşirlərinin ideya mövqeyi və estetik dünya görüşlərinə gəldikdə isə müəlliflərin qəzetdə çap olunan təqlidçiliyi, ənənələrə kor-koranə əməl etməyi tənqid edən, re al gerçəkliklə bağlı olan yeni mövzuları təbliğ edən məqalələri səmimi şəkildə bu mövqeyi təbliğlə təsvir edir. "Qələmlər birliyi" üzvlərinin əsərlərinə həsr olunmuş tənqidi məqalələrdə yalrnz ərəb mətbuatı üçün tipik olan təriflər dərc edilmir, nöqsan və qüsurlar da aşkara çıxarılır və təhliledilirdi (Krachkovsky, 2009:54).

Qəzet hər il "əl-Ədəd əl-mümtaz" ("Xüsusi nömrə") adı altında almanax nəşr edirdi. Bu almanaxda "Qələmlər birliyi"nin bütün üzvləri məqalə, şeir və novellalarla çıxış edirdilər. Onlar, həmçinin sırf texniki işlərdə də (redaktə işində, bədii tərtibatda, cildlərin maketləşdirmə işlərinin hazırlanmasında və s.) fəal iştirak edirdilər. "Əl-Ədəd əl-mümtaz"da başqa mühacir yazıçılar da çıxış edirdilər. Almanaxın hər bir buraxılışı Ərəb Şərqinin ictimai və mədəni həyatında vacib hadisə olmaqla yanaşı, həcmcə ən iri ərəb qəzetlərində geniş əks-səda doğururdu. Almanaxın hər bir sayını çoxsaylı həvəskar və peşəkar ədiblər tərtib edirdilər, Bir çox ərəb məktəblərində bu almanax əsasında dərslər keçirilirdi.

Görkəmli ərəb jurnalisti Doktor Yaqub Sərruf almanaxın fəaliyyətini qiymətləndirərək yazırdı: "Qəzet başqa mühacir nəşrləri arasında özünün gözəl qəsidələri, dərin məzmunlu hekayələri, eləcə də ciddi elmi-tənqidi məqalələri ilə fərqlənirdi" (İmanquliyeva, 2002: 71).

"Kağız üzərində mürəkkəblə yazılan hər şey ədəbiyyat deyil, qəsidə qoşan, yaxud məqalə yazan hərkəs də ədib deyil. Biz o şeyi ədəbiyyat adlandırırıq ki, həyat torpağından, onun işıq və havasından qida alır. Bizim hörmət etdiyimiz ədib hisslərin zərifliyinə, fikrin səlisliyinə diqqət verən, həyatın dəyişikliklərini, keşməkeşlərini sezə bilən və görən, rəvan, bəlağətli nitqə malik olan ədibdir. Ədəbiyyatımızı durğunluq mərhələsindən və təqlidçilikdən qurtararaq yeni fikir və üsluba körpü salan bu yeni ovqat bu günümüzün ümidi, sabahımızın təməlidir.

Var qüvvəsi ilə dilimizi, ədəbiyyatımızı məzmun və üslub cəhətdən təqlid etmək çərçivəsi ilə məhdudlaşdırmağa çalışan digər ovqat isə bizim qəti əqidəmizə görə, onları içəridən yeyən qurda bənzəyir. Bu qurdu məhv etməsələr, o elə bir vəziyyətə gətirib çıxaracaq ki, yüksəlişin və yeni nəfəsin tərəqqisi olmayacaq.

Bununla yanaşı, yeni ədəbiyyatın yaradılmasına səy göstərməklə biz keçmişin ədəbi ənənəsindən tamamilə üzülüşmək fikrində deyilik. Bu ədəbiyyatı görkəmli ədiblər, mütəfəkkir şairlər şöhrətləndirmişlər ki, onların əsərləri bir çox yazıçı nəsli üçün əbədi ilham mənbəyi olaraq qalacaq. Lakin buna kor-koranə əməl etmək müasir ədəbiyyatın ölümüdür. Onun canlı nəfəsini qoruyub saxlamaqdan ötrü biz müasirliyin ehtiyatlarından istifadə etməli, sabaha baxmağı bacarmalıyıq. Axı ədəbiyyatımızın bu günü dünənindən fərqlidir". "Qələmlər birliyi"nin təsis olunduğu yığıncaqda Mixail Nüaymənin söylədiyi bu sözlər onun bütün üzvlərinin məqsəd və səylərini aydın və dəqiq ifadə edir.

"Qələmlər birliyi"nin yazıçılarını, əsasən, müasir ərəb dilinin, ərəb poeziyasının forma və məzmununun yeniləşməsi, yeni ərəb nəsrinin yaradılması yollan kimi məsələlər maraqlandınrdı. Onlar ərəb şeir sənətini yeniləşdirməyə, onu müasirliyin ideya və estetik tələblərinə uyğunlaşdırmağa çalışırdılar. Bu səbəbdən onlar şeirlərin ahəngdarlığının artınlmasma və ritmin zənginləşdirilməsinə can atırdılar. Bu problemlər ətrafında mühacir şairlər arasında ciddi mübahisələr gedirdi. Xüsusilə də Cənubi Amerikadan olan ərəb ədibləri ilə "Qələmlər birliyi"nin üzvləri arasındakı fikir ayrılıqları daha kəskin xarakter daşıyırdı. Doğrudur, Cənubi Amerikada yaşayan mühacir-şairlərin arasında Qərbin ədəbi tərzini mənimsəməyə

cəhd edən islahatçı ədiblər də mövcud idi. Məsələn, Şükri əl-Hukri poetik dili sadələşdirməyə çalışırdı. O, həmçinin ədəbi əsərlərdə ərəb dialektindən istifadə etməyi təklif etsə də, onu dəstəkləyən tapılmadı. Əslində Cənubi Amerikada sığınacaq tapan ərəb şairləri klassik poeziya ustalarının davamçıları idilər.

Əş-Şair əl-Karəvinin fikrinə görə, ədib üçün ən gözəl nümunə Quranın dilidir. O yazırdı: “Məktəblərdə və universitetlərdə Quranı öyrənin ki, ədəbi dilə vərdiş edə biləsiniz, sizin əsərləriniz bəlağət inciləri iləoxucuları əfsunlaya bilsin” (Golubkov,1990: 89).

Şimali Amerikada yaşayan mühacir ədiblər ərəb ədəbi dilinin sadələşdirilməsi, onun sadə xalqın dilinə yaxınlaşdınlmasının tərəfdan idilər. Onlar ərəb dilini klassiklərin irsindən imtina etməmək şərti ilə arxaizmlərdən təmizləməyə cəhd edirdilər.

“Qələmlər birliyi”nin üzvləri ərəb ədəbiyyatında “şi’ir mansur” - mənsur şeir janrını yaratdılar ki, bu da həm nəsrin, həm də poeziyanın inkişafında bir addım irəliyə doğru hərəkət idi. Bu janrın müəllifi ərəb dünyasında tanınmış yazıçı və publisist Əmin ər-Reyhani idi. Cübran və Nüaymə isə ər-Reyhaninin bu istiqamətdə yolunu davam etdirərək yeni janra bitkinlik əlavə etməklə yanaşı, onun ədəbiyyatda yer tutubmöhkəmlənməsini şərtləndirdilər. Onlann mənsur şeirləri sadəliyi ilə fərqlənir, ritorika və təmtəraqdan uzaqdır.

Mənsur şeir janrı XX əsrin 10-20-ci illərində çox geniş vüsət almışdı. Bu şeirlərdə bəzən poeziya, bəzən də nəsr üstünlük təşkil edirdi. Azad, çoxçalarlı qafiyə isə yeni ərəb poeziyasının üzvi xüsusiyyətinəçevrilməklə yanaşı, burada sərbəst şeirin - ver- librin inkişaf etməsinə şərait yaratdı.

Mühacir yazıçılar yeni və orijinal bədii təsvir yollarını yalnız şeir sənətində deyil, nəsrdə də kəşf etdilər. Məsələ burasındadır ki, XIX əsr ərəb nəsrində klassik janr üstünlük təşkil edirdi. Roman, povest və hekayələr yalnız XIX əsrin sonlarına doğru meydana çıxmışdır.

“Qələmlər birliyi”nin nümayəndələri özlərinin hekayə, oçerk və povestlərini sadə, xalqa müyəssər olandildə yaradaraq, bununla da ərəb nəsrində hələ Səlim əl-Bustani, Circi Zeydan, Vəliəddin Yəkun, Mustafa Lütfı əl-Mənfəluti tərəfindən əsası qoyulmuş yeni istiqaməti davam və inkişaf etdirdilər. Mühacir yazıçıların yaradıcılığında iri əsərlər xırda həcmli əsərlər tərəfindən sıxışdınlırdı. Hekayə və esselər qəzetvə jurnallar üçün əlverişli olub, yazıçıları narahat edən problemləri əks etdirməyə və onları düşündürənhadisələrə çevik münasibət bildirməyə imkan verirdi.

Ərəb ədəbiyyatşünasları “Qələmlər birliyi” üzvlərinin şöhrət qazanmasını müxtəlif cür izah edirlər.Bəziləri bunu Qərb ədəbiyyatının təsiri ilə bağlayır, onlann uğurunu, ənənəvi vasitələrdən və əruz qaydalarından tam inkar etmələri ilə əlaqələndirirdilər. Lakin M.Nüaymənin qeyd etdiyi kimi, “bunlar boş söhbətlər idi. Bizim uğurumuzun təməli həyatı olduğu kimi, bər-bəzəksiz və təhrifsiz təsvir etməyimiz idi. Bizi babalarımızın torpağına olan məhəbbətimiz və işıqlı vətənpərvərlik hissləri ilhamlandınrdı” (Dolinina, 2007:10).

Əlbəttə, Qərb ədəbiyyatının “Qələmlər birliyi” üzvlərinin yaradıcılığına müsbət təsirini tamamilə danmaq olmaz. Düzdür, Amerikada yaranmış ədəbiyyata Amerika ədəbiyyatının təsirinin daha aydın təzahürü təbii bir şey kimi qəbul edilə bilərdi. Lakin bu, belə deyil, Amerika mühitinin bu coğrafi məkanda yaranan ədəbiyyata təsiri, əsasən, ərəblərlə Avropa arasında ən ümumi əlaqələr və vasitəçilik səviyyəsində özünü büruzə verirdi.

Ərəb mühacirlərinin əsərlərində daha çox Avropa romantizminin, xüsusilə də ingilis romantik şairlərinin - XIX əsrdə və Birinci Dünya Müharibəsindən sonra Amerika poeziyasına güclü təsir etmiş ingilis məktəbinin nüfuzu daha çox sezilirdi. ABŞ-da romantik ədiblər, başda Emerson (1810-1850) olmaqla transendentalizmə meyl edirdilər. Onlar kapitalizmin qəddarlığını tənqid edir, mənəvi kamilləşməyə, təbiətlə yaxınlaşmağa çağırırdılar.

XX əsrin 30-50-ci illərində ərəb mühacirlərinin yaratdığı bədii ədəbiyyat tədricən öz əhəmiyyətiniitirməyə başladı. Yaşlı nəslin bir çox nümayəndələri - Şimali Amerikada - Cübran Xəlil Cübran, NəsibƏridə, Rəşid Əyyub, Nədra Həddad, Uilyam Kətisflays, İlyas Atallah, Əmin Müşrik, Əmin Katib, Məsud Səmaha; Cənubi Amerikada - Fövzi əl-Məaluf Hüsni Girab, Mişel əl-Məaluf, Əbu Fədl-Falid, Yusif əl-Bəini və başqaları həyatdan köçdü. Ədiblərin böyük bir qrupu - Mixail Nüaymə, Corc Sayda,Səlma Saiq, İlyas əl-Məluf, Nazir Zeytun və başqaları vətənə qayıtdılar.

Mühacirətdə qalan yazıçılar sələflərinin başladığı işləri davam etdirməyə çətinlik çəkirdilər. Belə ki, bir çox mühacir yazıçıların övladları atalarının yolunu davam etdirərək qələmə sarılıb yaradıcılıqla məşğul olmağa başladılar. Doğrudur, yaşlı nəsildən olan bir çox yazıçılar, məsələn, Cübran Xəlil Cübran, Ə.ər-Reyhani, M.Nüaymə, F.Xitti, D.Kəddum, M.Kuaym öz əsərlərini çox vaxt ingilis dilində

yazırdılar. Lakin bu iki nəslin yaradıcılığı bir-birindən ərəb gerçəkliyi və doğma mühitlə bağlılığına görə fərqlənirdi. Yaşlı nəsil öz xalqının adət və ənənələrini, incəsənət və ədəbiyyatını yaxşı bilir, ərəb dünyasının maraqlan ilə yaşayırdılar. Yaradıcılığa yenicə başlayan gənc nəslin nümayəndələri haqqında isə bunlan demək mümkün deyil.

## Nəticə

Gənc ərəb mühacir yazıçılarının fəaliyyəti haqqında məlumat verə biləcək heç bir mənbəyə rast gəlinmir. Hazırda Şimali Amerikada yaşayan ərəb yazıçılan haqında bizə heç nə məlum deyil. Doğrudur, Cənubi Amerikada yaşayan yazıçı-ədiblərə Yusif əl-Bainin "Livanlılar Braziliya ədəbiyyatında" məqaləsi ("Məvalid əl-lubnəniyyun fı-l-ədəb əl-Brazili") həsr edilib. Müəllif məqaləsində Latın Amerikasının məşhur şairi Cəmil Mənsur Həddadm adını çəkir (194, 1, №7, 1949). C.M.Həddad özünün "Qara dualar" ("Salavat Səuda") divanı ilə tanınmışdır. Bu kitab Braziliya Elmlər Akademiyasının birinci mükafatına layiq görülmüşdü. "Qara dualar"da toplanmış şeirlərində Həddad öz lirik qəhrəmanını çıxılmaz vəziyyətlərdə təsvir edir. Müəllif Livan xalqının əzablarının səbəbini əksər hallarda köhnə ənənə və qalıqlarla bağlayır. Yusif əl-Baini öz məqaləsində başqa ərəb yazıçılarını da xatırlayır. Bunlar Amil Fərhad, Daun Nəsr, Amal Karlos, Sesil Qənimə, Diftı Cabbar, C. ət-Şidyaq- dır. Onların bir çox əsərləri fransız, ingilis, ispan, portuqal dillərinə tərcümə edilmişdi. Bu ədiblərin yaradıcı lığının əsas mövzusu yoxsulların çətin həyatı, acı ehtiyac, işsizlik idi. Adı çəkilən yazıçılardan savayı, Nəim Əbu Səmra və tənqidçi Mario Nəimə də həmin dövrdə tanınmışdılar.

"Ərəb divanı" (əl-Divan əl-Ərəbi"), "Ölümün gözəlliyi" ("Camal əl-Naut") kimi məşhur əsərlərin müəllifi olan Corc Solomonun Amerikada yaranmış ərəb ictimai fikrinin inkişafında böyük xidmətləri var. O, tez-tez həmvətənləri qarşısında çıxışlar edir, öz natiqliyi ilə aktiv ictimai fəaliyyət göstərirdi.

Ərəblərin Amerikada ədəbi fəaliyyətini səciyyələndirərkən, tənqidçi İsa ən-Nəuri yazır: "Ərəb ədəbiyyatı tarixində məlum olan bir çox sıçrayışlar arasında mühacir məktəbi həm forma, həm də məzmun baxımından elə bir irəliləyiş təşkil edir ki, bütün qalanlar onun yanında sönük görünür".

Tam əsasla belə bir nəticəyə gəlmək olar ki, mühacir yazıçılar yeni ərəb ədəbiyyatının yaradılmasındaböyük xidmətlər göstərmişlər. Ənənəvi bədii təsvir üsulunu və fəndlərini tənqid edərək onlar keçmişinklassik irsindən yaradıcı şəkildə, müasirliyin tələblərinə müvafiq istifadə etməyi, yeni ədəbi janr və formalara həyat verməyi bacarmışlar.

## Ədəbiyyat

1. Braginsky, I. (2009). To the results of the discussion on the formation of realism v literature of Vostok. Sat. "Problems of the formation of realism in the literature of the East", 290 p.
2. Gibb, H. (2005).Arabic literature. 390 p.
3. Dolinina, A. (2001). Gogol in Arabic literature. Sat. "Gogol. Articles and materials", 280 p.
4. Al-Kayali, M. (2011). About modern Arabic literature. - Sat. "Modern Arabic literature". 310 p.
5. Konrad, N. (2006).The problem of realism and literature of the East. Sat. "Problems of the formation of realism in the literature of the East". 340 p.
6. Dolinina, A. (2003). From the prehistory of realism in new Arabic literature. Sat. "Problems of the formation of realism in the literature of the East". 1964.
7. Krachkovsky, I. (2009). Autobiography of Mikhail Nuaime. Selected compositions, 280 p.
8. İmanquliyeva, A. (2002). "Qələmlər birliyi" və Mixail Nüaymə. Bakı, Elm, 180 s.
9. Golubkov, V. (1990). The mastery of A.Chekhov. 190 p.
10. Dolinina, A. (2007).Essays on the history of Arabic literature of the new time. Egypt and Syria. Publicistics. 290 p.

Göndərildi: 08.05.2022 Qəbul edildi: 18.07.2022

DOI: https://doi.org/10.36719/2706-6185/13/26-33

**Gülər Sabir qızı Abdullayeva**
AMEA Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutu
doktorant
guler32114@gmail.com

# ŞEYX QALİB DÜHASI VƏ ONUN TƏDQİQ TARİXİNDƏN

**Xülasə**

XVIII əsr Türk təsəvvüf ədəbiyyatının son nümayəndələrindən olan Şeyx Qalib klassik ədəbiyyatın zənginləşməsində əvəzsiz rol oynamışdır. Onun sonrakı nəsillərə qoyub getdiyi gözəl nümunələr mənəvi dəyərlərin inkişafında tükənməz rola malikdir. Şairin atası mövləvi şeyxlərindən olmuş, Mövlanaya olan sonsuz məhəbbəti atası vasitəsilə şairə siraət etmişdir. Qalib divanında o da məlum olur ki, şair Mövlananın "Məsnəvi"sini on bir dəfə oxuyub. Həyatını o ibrətamiz hekayətlər əsasında yaşamağı əsas tutub.

Bir müddət III Səlimin sarayında yaşayan şair ona olan sonsuz hörmətini divanında lirik boyalarla əks etdirmişdir. Divanda III Səlimə həsr olunmuş xeyli şeirlər var.

Şeyx Qalib yaradıcılığının tədqiqinə Türkiyədə hələ əsrin əvvəllərində müraciət olunub. Şairin yaradıcılığı haqqında ilk məlumat verənlərdən biri F.Köprülü olmuşdur. Sonra H.Ayan, M.Nurdoğan, N.Okcu və başqalarını göstərə bilərik. Azərbaycanda isə ilk dəfə şair haqqında söz açanlardan biri M. Quluzadə, A.Abi, X.Hümmətovanı göstərmək olar.

***Açar sözlər:*** *Şeyx Qalib, poeziya, mövləvi, III Səlim, F.Köprülü, H.Ayan, M.Quluzadə, A.Abi*

**Guler Sabir Abdullayeva**
ANAS Institute of Literature named after Nizami Ganjavi
PhD student
guler32114@gmail.com

## From the genius of Sheikh Ghalib and the history of his study

**Abstract**

Sheikh Ghalib, one of the last representatives of Turkish Sufi literature of the 18th century, played an invaluable role in enriching classical literature. The excellent examples that he left for the next generations play an inexhaustible role in the development of moral values. The poet's father was one of the Mavlavi sheikhs, and his endless love for Mavlana was passed on to the poet through his father. It is also known that on the divan of Ghalib the poet read Maulana's "Masnavi" eleven times. He built his life on these cautionary tales.

The poet, who lived for some time in the palace of Selim III, reflected in lyrical colors on the sofa his infinite respect for him. The Divan has many poems dedicated to Selim III.

The study of the work of Sheikh Ghalib was addressed in Turkey at the beginning of the century. F.Koprul was one of the first to inform about the poet's work. Then we can show H. Ayan, M. Nurdogan, N.Okcha and others. Among those who spoke about the poet for the first time in Azerbaijan, we can name M. Guluzade, A. Abi, H. Hummatova.

***Keywords:*** *Sheikh Ghalib, poetry, Mevlevi, Selim III, F.Köprülü, H.Ayan, M.Kuluzade, A.Abi*

## Giriş

Şeyx Qalib XVIII əsr Türk divan ədəbiyyatının son ən böyük nümayəndəsi olmuşdur. Şairin əsl adı Mehmed Əsəd idi. O, 1757-ci ildə İstanbulda böyük mövləvi şeyxi olan MustafaRəşidin ailəsində doğulmuşdur. Onun atası təsəvvüf əhli olub mövləvilik təriqətinin nümayəndələrindən biri idi. Anasının adının Əminə Xatun olmasına həsr etdiyi şeirdə rast gəldik, anasının ölümü səbəbi ilə yazdığı bir şeirində həm onun adını anması, həm də vəfatına şairin münasibətini görürük.

Validəm kim Əminə Xatundur,

Ruhu olsun naim- əmne əlif.
Gəldi tarixi rihləti Qalibəm
Ola ya rəb makami huld-lətif (Qalib, 2011: 9)

Bu şeirdən anasının 1794-cü ildə vəfat etdiyi bilinir. “Belə anlaşılır ki, Qalib davamlı bir mədrəsə təhsili almamış, fəqət ailə mühitində və Mövləvi təkkəsində klassik əsərləri layiqiylə təhsil etmişdir. “Atasından sonra onun əsl müəllimi və mürşidinin 1790-cı ildə Qalata Mövləvixanəsi şeyxi olan Aşçı-başı Hüseyn Dədə olduğu bilinir” (Tülücü, dərgi, 254). Şair kiçik yaşlarında mövləvi söhbətlərinin əhatəsində böyümüş və onların təsiri altında boya-başa çatmışdır. Bütün bunlar Qalibin dünyagörüşünün formalaşmasında ciddi rol oynamışdır. İlk təhsilini atasından alan şair onun yolunu davam etdirdiyini, atasının ruhuna dualar etdiyini, şeirlərində atasını “mürşidi - usdadi - Pir” deyə öydüyünü görürük.

Peyrev oldum mən də Qalib validi zişanıma,
Küm duavü medhi həm farzü həm əlzəmdir bizə.
Mustafa nami Rəşidü mürşidi ustadi küll.
Hər nigahi himməti iksiri azmdir bizə (Qalib, 2011: 9).

Daha sonra şairin divanından o da məlum olur ki, “Hüsn və Eşq” məsnəvisinin “Merac “bölmünü atasının xahişi ilə yazmışdır. Qalib atasından ərəb və fars dillərini mükəmməl öyrənmiş, Mövlana Cəlaləddin Rumiyə olan məhəbbəti şairə atası aşılamış, bütün bunlar da onun bir şair kimi formalaşmasında önəmli rol oynamışdır. O, ilk şeirlərini “Əsəd” təxəllüsü ilə yazmış, sonradan isə “daha güldən, bülbüldən” yazmağın zamanını keçdiyini deyərək, yeniliklər axtarışında olmuşdur.

Şeyx Qalib bir müddət atasının mövləvixanəsinədə yaşamış, sonra Konyaya getmiş, Mövlana dərgahında şeyxlik etmişdir. Bu hadisə III Səlimin taxta çıxdığı vaxta təsadüf edir. Tarixdən bəllidir ki, hökmdar şeir və şairə sevgi bəsəyirdi. O zamana qədər III Səlim Şeyx Qalibin şeirləri ilə tanış idi. “Digər tərəfdən şairin şeirlərindəki qüdrətə heyran olan hökmdar onun divanına 3000 lirə sərf edərək yazdırmış və cildlətdirmişdir” (Dədə, 2000: 383). Şair təbiətinə malik olan hökmdar atasından aldığı təhsil və tərbiyənin müqabilində “qəfəs həyatını” tərk etmiş, daha çox şeir və musiqi ilə məşğul olmuş, yeri gəldikdə şeirlər yazmış, musiqilər bəstələmişdir. Ruhiyyat aləmi etibarilə bir mövləvi dərvişi olub osmanlı taxtında oturan III Sultan Səlim ağlı ilə “əqli-səlim”, sənətkarlara dəyər vermə baxımından “qəlbi-səlim”, aparılan söhbətlərdən aldığı zövqə görə “zövqü-səlim” kimi adlarla ilə yadda qalıb. Qalibin divanından görürük ki, dövrün hökmdarı III Səlim şairlə dost olmuş, divanında ona həsr etdiyi şeirlər xüsusi yer tutur. Şeirlərinin birində belə deyir:

Kərəmlər kim sənin dövründə gördü Qalibi - naçar,
Hüseyn Baykaradan görmədi Cami kimi yekta.
Sənin sayəndə dərgahi fələkmanəndi Mönlada
Bu abdi kəmtərinin namı oldu şeir ilə ikba (Qalib, 2011: 35).

III Səlim sənəti ilə səltənəti arasında əlaqə yaradan şeirə, musiqiyə və sənətkara daim qiymət verən bir hökmdar olmuş, həm də “düşməndən intiqam alınmayınca qılınc qınına girməyəcək” ideyası ilə yaşamışdır. “Mən şahzadə ikən ölkəmdən qara xəbərlər eşidərkən ağlardım,gözümə yuxu getməz olurdu, indi padşaham halımı bir düşünün, deyərək həm dövlətini düşünən, həm də incə bir qəlbə malik olan insan olduğunu görürük” (Çıpan, 2016: 20).

Şairə sonsuz məhəbbət və hörməti olan hökmdar onu saraya dəvət etdiyi zaman özü onu qarşılamış və bununla da şairə ehtiramını bildirmişdir. Bir müddətdən sonra hökmdarın arzusu ilə Qalata mövləvixanəsi əsaslı şəkildə təmir olunmuş, oranın şeyxi vəzifəsi də Şeyx Qalibə həvalə edilmişdir. III Sultan Səlim, tez-tez Qalata Mövləvxanəsinə gedər və mövləvi söhbətlərinə qulaq asarmış. O, taxta çıxmazdan önçə şeirə böyük ehtiram göstərmiş, Şeyx Qalib sarayda yaşayanda belə padşah hər gün onu “Şeyxim, şərəf verdiniz” deyə qarşılayarmış.

III Səlimin sarayında şairin həyatının ən gözəl anları keçmiş, sarayda özünə qarşı çox böyük

hörmət və ehtiram görmüşdür. Əlbəttə, belə bir hörməti görən şair şeirlərini də yüksək şövqlə yazmaqda davam edirdi. Odur ki, çox keçmir hökmdar ailəsi ilə şair arasında çox isti münasibət yaranır. Həmişə hökmdar ailəsindən hörmət görən şair ailənin sevimlisinə çevrilir. Bu səmimi münasibət şairlə hökmdarın bacısı Beyhan Sultanla arasındakı böyük bir eşq hekayəsinin yaranmasına gətirib çıxarır. Beyhan Sultanla şair bir müddət "Hüsn və Eşq" macərası yaşayırlar. Bu haqda ədəbiyyatda müxtəlif rəvayətlər mövcuddur. Sarayda böyük bir eşqin hekayəsini yaşayan şair "Hüsn və Eşq" əsərini də altı ay müddətində orada yaşadığı zaman yazmışdır. "Hüsn və Eşq" əsəri gerçəkdən böyük bir eşqin yolçuluğunun təzahürüdür (Kut, 2016: 112). Çox az bir ömür yaşayan Şeyx Qalib bir müddət III Sultan Səlimin sarayında çalışmış, Osmanlı sarayının gözəl xanımlarından olan Beyhan Sultan ilə aralarında bir "hüsn eşq macərası" yaşamışdır. Şair qəsidələrinin birində belə söyləyir (İslam Ensiklopediyası, 1980: 145):

Ol şahənşah kim kamali bəxşişindən hələ,
Xahəri Beyhan Sultana müyyəssərdir bu kah (yəni-ev, köşk)

Qəsidədən məlum olur ki, ata əvəzi olan qardaşı Sultan Səlimin bacısına bəxşiş olaraq verdiyi köşk idrak nuru ilə bəzənib. Sultan Beyhan xanım o köşkü öz gözəlliyi ilə abad edib, oraya bahar lütfünü bəxş edib (Qalib, 2011: 245).

Şairin III Sultan Səlimlə tanışlığı həyatında böyük rol oynamışdır. Şeirə və sənətə hədsiz hörməti olan III Səlim həmişə şairə baş çəkərkən ona qiymətli hədiyyələr gətirərmiş. Bir dəfə də şairi ziyarətə gələndə Cövri Çələbi tərəfindən yazılmış bir məsnəvini Şeyx Qalibə bağışlayır. Hökmdarın bu hədiyyəsi şairi çox sevindirir. Bu bir də onu göstərirdi ki, hökmdar şeirə, sənətə, şairlərə yüksək qiymət vermiş, dövrünün şairləri ilə həmişə əlaqədə olmuşdur. Hökmdarın bu hədiyyəsindən sevinən şair onun üçün bir şükranlıq qəsidəsi də yazmışdır.

Bir müddət gənc yaşlarında Əsəd adı ilə şeirlər yazan şair şeirlərinin başqalarının yazdıqları ilə qarışmasını istəmədiyi üçün onu "Qalib" təxəllüsü ilə əvəz etmişdir. Şair "Əsəd" təxəllüsündən birdən-birə əl çəkməmiş, bir müddət həm "Əsəd", həm də "Qalib" təxəllüsləri ilə şeirlər yazmışdır. Şairin müxtəlif təxəllüslərdə şeirlər yazması bəzən dedi-qodulara səbəb olmuş, hətta dövrünün tanınmış şairi və onun müasiri olan Sürури bir qitəsində Qalibə sataşaraq yazırdı:

Bilməm, ey mənhus, adın Əsədmidir, Qalibmidir,
Zatını tərif qıl kimsən, kimə mənsubmusan (Qalib, 2011: 11).

Bəzi mənbələr yazır ki, Şeyx Qalib bir gün şeir məclisində olarkən orada görkəmli türk şairi Nabinin yaxın zamanlarda yazılmış bir məsnəvisi haqqında gözəl fikirlər deyilmiş və onun bu əsərinə hələ ki, tayı-bərabəri olan bir əsərin olmadığı söylənmişdir. Bu sözlər Qalibə toxunmuş, o əsərin çatışmayan cəhətlərini göstərmişdir. Məclisdəkilər: əgər bacarırsan, ondan yaxşı bir əsər yaz, - demişlər. Bu sözdən sarsılan şair bir müddət sonra "Hüsn və Eşq" kimi ölməz bir əsər yazmışdır.

Şeyx Qalib daxili dünyasını bəzən şeiri bəzən də musiqi dili ilə ifadə etmişdir. Şairin vəfatı ilə bağlı elmi ədəbiyyatda bir çox rəvayətlər məlumdur. Bildiyimiz kimi" şair ağ ciyər xəstəliyindən əziyyət çəkirmiş, qırx iki il ömür yaşamışdır" (Nihat, 1985: 128). Ömrünün son günlərində baş verən hadisələr onun həyatında dərin izlər buraxmışdır. Bu səbəblərdən biri şairin 1796-cı ildə anası Əminə xatının və yaxın olduğu Əsrar Dədənin vəfatı olmuşdur. Onların ölümü münasibəti ilə şair mərsiyyə də yazmışdır.

Qan ağlasın bu dideyi durbarım ağlasın,
Ansın o mənim yari vəfadarım ağlasın.
Ceşmi dəhanü arizi rüxsarım ağlasın,
Başdan-başa bu cismi siyahkarım ağlasın.

Ağlarım ağlasın mənə həm yarım ağlasın
Güş eyləyən hekayət Əsrarım ağlasın.
Nə didə bir göhər tələf etdim, dirigü ah

Haq içrə dəfn edib geri getdim, dirigü ah (Qalib, 2011: 583).

Mərsiyyənin məzmunundan şairin acı çəkdiyi, bu hadisəyə çox üzüldüyü məlum olur. Şeirin sonrakı misralarında Əsrar Dədənin "şərifi aləmə bir yadigar idi" deməsi, onun bu aləmə bizə əmanət olaraq gəldiyini deyir. Sonra şair "şəb misalı şəm mənimlə yanar idi, yanımda enişi nahar idi" deməsindən onların çox yaxın münasibətdə olduqlarını görürük.

Bütün bu baş verənlər incə ruhlu şairin xəstəliyinin şiddətlənməsinə səbəb olur. O, 1799-cu il yanvar ayında vəfat edir və Qalata mövləvixanəsində məsnəvi şairi İsmayıl Rusuhinin ayaqı altında dəfn edilir.

XVIII əsr Türk şairi Şeyx Qalib haqqında Türkiyədə ilk elmi məqalələr yazan Fuad Köprülü (1890-1966) olmuşdur. F.Köprülü "Şeyx Qalibin qəzəlləri" adlı ilk məqaləsini 1912-ci ldə yazmışdır. Müəllif bu məqaləsində ən çox Şeyx Qalibin "Hüsn və Eşq" əsərindən söz açır və oxuculara belə bir şairin olduğunu tanıtmaq istəyir. Müəllif bu məqaləsində onun da qeyd edir ki, Şeyx Qalibi təkcə "Hüsn və Eşq" şairi kimi tanıtmaq da haqsızlıq olar. Onun rəngi rahiyyə dolu qəzəlləri də var. Köprülü bu məqaləsində Ziya Paşanın Şeyx Qalibin "Hüsn və Eşq"i yazmaq üçün bu cahana gəldiyi fikrinə qarşı öz mülahizələrini də bildirmişdir. O, qeyd edir ki, Qalib "Hüsn və Eşq" əsərinin yazmasaydı belə qəzəlləri ilə insanlar tərəfindən tanınıb seviləcəkdir.

Müəllif başqa məqaləsində Şeyx Qalibin Türk təsəvvüf şairlərindən olduğunu, divanında Mövlananı vəsf etdiyini, ondan ilhamlanaraq şeirlər yazdığını göstərmişdir. Həm də tədqiqatçı Türk ədəbiyyatında Hindi–Səbkinin Qalibin yaradıcılığına təsirindən də bəhs edərək göstərir ki, şairin poeziyasında Füzulinin, Nabinin təsiri duyulmaqdadır. F. Köprülü yazır : "Özəlliklə "Hüsn və Eşq"dəki xəyal dünyası üslub və obrazlar sonra bir çox şairi cəzb etmiş, nəzirə dairəsində Gülşəni aşiq, Atəşgədə və Can və Canan məsnəvilərinin yazılmasına vəsilə olmuştur. Şairin qəzəllərinə və "Hüsn və Eşq"ə yazılan nəzirələr klassik Türk şeiri ənənəsinin bir gərəyi olaraq görülə bilir (Kahraman, 2019: 143-162). Daha sonra F.Köprülü Sərvəti-fünun dönəmində "Şeyx Qalib" məqaləsinin çap etdirmiş, şair haqqında geniş oxucu kütləsinə məlumat vermişdir. F.Köprülü Şeyx Qalib haqqında yazdıqlarını Bartin Universitesi Ədəbiyyat Fakültəsi Türk dili və Ədəbiyyatı bölümünün professoru Gülay Karaman bir yerə toplayaraq "Fuad Köprülünün Şeyx Qalibə dair yazdıqları üzərinə bir dəyərləndirmə" adı altında geniş məzmunda bir kitab hazırlamışdır. Bu kitabda F.Köprülünün Şeyx Qalib haqqında yazıları və mülahizələri geniş şəkildə öz əksini tapıb.

Bu kitabda müəllif qeyd edir ki, Ömər Faruk Akün Köprülünün məqalələrindən söz açaraq göstərir ki, o, öz məqaləsində üç böyük şairdən bəhs edir. Əhməd Paşa, Şeyx Qalib və Bakının hal-tərcümələrinə dair qeyd edərək onların yaradıcılığının bir-birindən təsirləndiyin, ifadə özəllikləri ilə bir-birinə təsir etdiyini qeyd edir. Bu əsərdən məlum olur ki, F.Köprülünün Şeyx Qaliblə əlarədar yeddi məqaləsi var. Bu məqalələr müxtəlif dönəmlərdə tədqiqatçılar tərəfindən latın qrafikasına çevrilərək çap olunmuşdur. Bu haqda Mehmet Kaplan onu da qeyd edir ki, Köprülünün gənclik illərinin məhsulu olan digər məqalələri ilə birlikdə Şeyx Qalibə dair yeddi məqaləsini də günümüzün Türkcə əlifbası ilə yazılmışdır. XIX əsrdə Şeyx Qalibin qəzəllərinə və "Hüsn və Eşq"məsnəvisinə yazılan nəzirələrdən məlum olur ki, o dövrdə bu bir dəb halını almışdır. Dövrün bütün öndə gedən qələm sahibləri Qalib şeirlərinə nəzirələr yazmışdılar. Şeyx Qalibin "Şəmim gül gətirir bağa qurbanı bahar" misrası ilə başlayan şeirinə Təhsin Nahid nəzirə yazmışdır.

Şeyx Qalibin "Hüsn və Eşq" əsərini 1975-ci ildə nəşrə hazırlayan və əsərə geniş ön söz yazan Hüseyin Ayan və Orxan Okay olmuşdur. Bu tədqiqatçı alimlər kitaba geniş və əhatəli şərh yazmaqla yanaşı, əsərin dili ağır olduğu üçün onu izah və açıqlamasını vermişlər. Böyük uğur qazanan əsər "Dərgah" yayınları tərəfindən müxtəlif illərdə 1975, 1992, 2000, 2005-ci illərdə dəfələrlə çap olunmuşdur.

Abdulbaqi Gölpınarlı 1994-cü ildə "Şeyx Qalib Divanından seçmələr" adı altında şairin şeirlərini çap etdirmişdir. Sonra şairin Gölpünarlı "Hüsn və Eşq" əsərini müxtəlif zamanlarda geniş ön söz və izahlarla çap etdirmiş, əsərin Türk klassik ədəbiyyatındakı yerindən söz açmışdır. Bu əsərin təsəvvüf poeziyanın sonrakı dönəmlərində özündən sonra neçə-neçə əsərlərin yazılmasına səbəb olmasınsan və təsir dairəsindən söz açmışdır.

Əli Nihat Tərlanın "Ədəbiyyat məsəlləri" kitabında şairin əsərlərindən nümunələr verilmiş, Şeyx Qalibi geniş oxucu kutləsinə təsəvvüf ədəbiyyatının son nümayəndəsi kimi təqdim etmişdir.

Minə Mengi "Eski Türk ədəbiyyatı tarixi" kitabında şair haqqında söz açaraq onun İstanbulda

doğulması, təkkə təhsili alması, III Səlimin sarayında yaşaması haqqında məlumat verməklə yanaşı, onun divanından seçmələr də vermişdir.

Şairin Divanı isə Naci Okcu tərəfindən 2010-cu ildə çap edilmişdir. O, şairin həyatı, ədəbi kimliyi, şeirlərinin ümumi təhlilindən geniş söhbət açılmışdır. Bu kitabda şairin həyatı haqqında məlumat, onun təriqət müəllimləri, təhsili haqqında ətraflı məlumat verməklə yanaşı, şairin divanını incələyərək oradakı şeirləri qruplaşdırmışdır.

Naci Okcu tərəfindən nəşrə hazırlanan divana müəllif geniş məzmunlu ön söz yazmışdır. Bu kitabda Şeyx Qalibin türkcə şeirlərindən başqa, ərəb və farsca şeirləri, bir də "Hüsn və Eşq"əsərində keçən ayə və hədisləri, indiyə qədər heç yerdə çap olunmayan bəzi təsəvvüfi məzmunlu beytləri də daxil edilib. Müəllif həm də divanda farsca şeirlərin təshihini verən, o şeirlərin əlyazma nüsxələrini oxuyan tədqiqatçı alim yoldaşlarına da təşəkkür etməyi unutmamışdır.

Naci Okcunun tərtib etdiyi Şeyx Qalib divanı 960 səhifədən ibarətdir. Bu divanın 636 səhifəsini şairin latın qrafikası ilə yazılan şeirləri, yerdə qalan hissənində isə əlyazma nüsxələrin foto surətləri yer alır. Mükəmməl tərtib olunan bu divan müxtəlif başlıqlara bölünür.

Əsərin birinci bölməsində tədqiqatçı Şeyx Qalibin həyatı və əsərləri haqqında danışır. Şairin həyatından söz açan müəllif onun ilk tərbiyəçisi atası olduğunu, onun təsiri ilə mədrəsədə təhsil alması və mövləvi dərsləri verməsi, ən nəhayət "Hüsn və Eşq" poemasını yazan bir şair kimi formalaşmasından bəhs edir. Daha sonra Naci Okcu Şeyx Qalibin bizə gəlib çatan əsərlərini sadalayaraq göstərir ki, şairin divanı, "Hüsn və Eşq" əsərindən başqa onun "Əs-söhbətüs səfiyyə", "Şərhi cəzireyi məsnəvi", "Təzkireyi şüərayi mövləviyyə" (Mövləvi şairlərinin təskirəsi) adlı əsərlərinin olduğunu bu bünə qədər dövrümüzə qədər gəlib çatdığını bildirir .

Kitabın sonrakı bölümünü müəllif "Şairin ədəbi şəxsiyyəti, dil və ifadə özəllikləri" adlandırır. Bu başlıq altında verdiyi hissədə Qalibin "Hüsn və Eşq" əsəri ilə ədəbiyyata yenilik gətirməsindən, köhnə ənənələrə sığmadığın; izah edir. Dilinin ifadə tərzinin ağırlığı şairin fitri istedad və ifadə özəlliklərinin dərinliyindən xəbər verir. Onun dili təmiz və aydın Türk dili idi. Yeri gəldikdə şair sadə və aydın türkcədə fikrini ifadə etməyi də bacarırdı:

Tökdü omuzdan pusu saçağını,
Açdı könüllər dəli bayrağını.
Ay yenisi göydə nə ülkər satar,
Dəyməyəcək kəsdiyi dırnağını.
Göyçəgimiz boyamaq istər mənim,
Al boyayın qan ilə dodağını (Qalib, 2011: 26).

Göstərilən nümunədən şairin dilinin xalq dilinə yaxınlığı, ağızlarda işlənən ifadələrin poetik şəkildə əksini görürük. Daha sonra şairin divanında atalar sözlərini nəzmə çəkdiyinin də şahidi oluruq. Qalib deyir:

Hər kim huzuri qəlb araya qəlbi gözləsin,
Esbabi yeşi sanma ki, Gahi sera verir (Qalib, 2011: 26).

Burada şair atalar sözü kimi işlənən "rahatlıq istəyən kişi başqasının qəlbini qırmasın" ifadəsini poeziyanın dili ilə daha gözəl ifadə edir.

Kitabda "Dini ünsurlər" adı altında verilən bölümdə Şeyx Qalibin dini kəlimə və ifadələrdən hansı məqamlarda və nə məqsədlə işlətməsindən bəhs edir. Naci Okcu Şeyx Qalib divanında Allah, Mələklər, Cəbrail, Əzrail, Mikayıl, İsrafil, Qurani – Kərimdə adı keçən peyğəmbərlərin onlardan söz açması və dini ayələri ifadə edən beytlər göstərir. Bu dini terminlərdən Şeyx Qalib poetik ifadə vasitəsi kimi divanında necə istifadə etdiyini, onların bədii təsvir və ifadə özəlliklərini şeir dili ilə oxuculara çatdırması şairin ilahiyyat elminə dərindən bələd olduğunu göstərir. Divanda dini termin kimi yer alan cənnət və cəhənnəm sözlərindən istifadə edən şair bu ifadələrinin arxasında öz məqsədini açıqlayır. Şair cənnətə inanmayan, ona şübhəsi olan insanın oraya düşəcəyinin mümkünsüzlüyünü şeir dili ilə belə ifadə edir.

Gəlirsən dəlmə bəzmə zahida bir afəti cansız
Bilirsən girmək olmaz bağı-xuldə çünki imansız (Qalib, 2011:48).

Şair bu beytdə iman əhlinin gözəli görmək üçün ilahi dərgaha imansız girməyin mümkün olmadığını deyir.

Divanın sonrakı bölümü “Sevgiliyə aid gözəllik ünsurləri” adlanır. Bu bölümdə müəllf şairin işlətdiyi qaş, göz, zülf, ləb, mah, bülbül və s. məzmunlardan söz açır. Onların şeirdə işlənmə məqamına aydınlıq gətirir.

Kitabın son bölümü “Təsəvvüf” adı altında təqdim olunur. Burada vəhdət, kəsrət, fəna. aşik, fəqir və s. təsəvvüf terminlərini mahiyyətinin Şeyx Qalib şeirində kəsb etdiyi məqamlar sadalanır. Naci Okcunun hazırladığı bu divanda şairin qəzəl, qəsidə, təxmis, tərkibbən, tərcibənd, qitə, tək-tək beytləri və s. şeir nümunələri toplanıb. Sonda isə müəllifin istifadə etdiyi qaynaqlar öz əksini tapır.

2017-cı ildə Ali Cançelik “Osmanlının Bilginləri” - 9 silsiləsindən “Şeyx Qalib” kitabını çap etdirmişdir. Bu kitab beş başlıqdan ibarət olaraq oxuculara təqdim edilir. Birinci bölümdə şairin doğumu, ailəsi, ilk sənəti məktəb illəri və şeirləri haqqında məlumat verir. Daha sonra bu bölümdə şairin mövləvilik təriqəti və onun təkkə həyatından bəhs olunur. Şairin III Səlim ilə münasibəti və onun hakimiyyətindən söhbət açılır (Cançelik, 2017: 36).

Kitabın ikinci bölümündə şairin “sənət və düşüncə” dünyasından söz açılır. Şairin Divanı və “Hüsn və Eşq” məsnəvisindən, şairin mövləvi şairlərinin şeirlərinə dair yazılan təskirələrdən söz açılır. Sonra isə şairin təsiri və təsirləndikləri haqqında məlumat verir. Sonrakı bölümdə isə şairin əsərlərindən seçmələr verilir. Türk ədəbiyyatında Şeyx Qalib haqqında yüzlərlə məqalələr və tədqiqat əsərləri yazılıb. Şairin “Hüsn və Eşq” əsəri müxtəlif illərdə ayrı-ayrı tədqiqatçılar tərəfindən əlyazma nüsxələri oxunub çap etdirilib.

1916-cı ildə Türkiyədə “Dərgah” yayınları tərəfindən “Əsəri-Eşq” adlı məcmuə çap olundu. Buraya Şeyx Qalib haqqında məqalələr və biblioqrafiya öz əksini tapıb. Məcmuə iki bölmədən ibarətdir. I bölmə “Məqalə və bildirilər”, II bölümə isə “Osmanlı Türkcəsindən axtarmalar” adlanır. Məcmuəni çapa Hanifə Koncu – Müjgan Çakar və Leyla Alptekin Sarıoğlu hazırlayıb.

Məcmudə qırxdan çox müəllifin məqaləsi yer alır. Oradakı ilk məqalə Əhməd Doğanın “Şeyx Qalibin “Düşdü” rədifli qəzəlindəki imgələr üzərində” adlanır. Müəllif qəzəldə işlənən bədii təsvir və ifadə vasitələrindən söz açır.

Yenə zövraki dərunum qırılıb kənara düşdü
Dayanırmı şişədir bu rəhi sengsara düşdü
O zaman ki, bəzmi canda bölüşüldü kalei kam
Bizə hissi məhəbbət hissi parə-parə düşdü.

Qəzəlin birinci beytində aşiq könlünün qayığının eşq dəryasında daşlara dəyib şüşə kimi qırılıb paramparça olmasından söz açır. “Müəllif “könül” ifadəsinin divan ədəbiyyatında saysız məcaz və təşbehlər yaratdığını deyir. Nümunə kimi verilən beytdə müəllif könülü ruhani bir aləm olaraq dəyərləndirilir” (Doğan, 2016: 31-37).

Məcmuədəki maraqlı məqalələrdən biri “Şeyx Qalib şeirlərində mövləvi böyükləri” adlanır. Məqalənin müəllifi Ərdoğan Taştandır. O, məqalədə Mövlanənin ölümündən sonra oğlu Sultan Vələnd və onun nəvəsi Ulu Arif Çələbi tərəfindən fəaliyyət göstərən mövləvi təriqətinin çox geniş əraziləri əhatə edən bir təriqət olduğunu vurğulayır. Bu təriqət təkcə dini ideyaları deyil, sosial, ictimai və siyasi sahəsini də öz təsirinə aldığını qeyd edir. Müəllif həm də onun qeyd edir ki, Anadoluda Türk ədəbiyyatının əsasını XIII əsrdə qoyan Əhməd Fakir, Səyyad Həmzə və Yunus Əmrə kimi sənətkarlar Mövlanədən təsirlənmiş və onun ideyalarını yaydığını göstərir. Müəllifin məqaləsində diqqət çəkən cəhətlərdən biri odur ki, klassik Türk şeirində Mövlana adı müxtəlif təşbehlərlə yad edilir. “ Mövlana, Xudavəndigar, Molla, Mollayi - Rumi, Həzrəti –Monla, Həzrəti-Monla Cəlal, Cəlaləddin Rumi, Həzrəti- Rum, Həzrəti –Pir, Mövləvi, Sultani- Eşq adlarının lması haqqında məlumat veriri.Eyni zamanda qeyd edir ki, şairin nisbəsi ilə bağlı yazılan mədhiyyələr də var. Belə ki, Rumi, Bəlxi, Konyəvi nisbələrinin Qalib divanında keçməsi haqqında məlumat verir” (Erdoğan, 2009: 104-105).

Mətin Akkuşun "Şeyix Qlibin şeir və şair yorumları: "Hüsn Eşqdə" poetika" adlandırdığı məqalədə Aristotellə başlayan poetika sənətindən söz açaraq, günümüzə qədər gəlib çatan bu sənətin özəllikləri haqqında danışır. Klassik ədəbiyyatda şeir sənəti kimi tanınan poetika Fərabi, İbn-Sina, Mühiyyəddin Ərəbi kimi islam şairlərinin də müraciət etdiyindən söz açır. Məqalə müəllifi Qalibin şeir sənəti haqqındakı mülahizələrini onun özü haqqında yazdığı fəxriyyələri ilə əlaqələndirir. " Qalibin şeir sənətinə baxışının (poetika:şeir fəlsəfəsi) özünü bəyənmə (fəxriyyə) və başqasını tənqid (həcviyyə) tərzlərinə tanışlıq edən beytlər söyləmiş olmasına doğal bir gəlişmə olacağı qəbul edilmişdir" (Eseri-Aşk, 2016: 178).

Mətin Akarın "Kaşqarlı Mahmuddan Şeyx Qalibə uzanan kultur körpüsü" məqaləsində müəllif göstərir ki, həzrəti peygəmbərlə bağlı şeirlərə yazılı ədəbiyyatda ilk dəfə Mahmud Kaşqarlının divanında rast gəlinir. Sonradan isə peyğəmbər mövzusuna bütün klassiklərin yadadıcılığında təsadüf olunur. Şair peyğəmbərin "merac möcüzəsi aydınlıq bir gecədə gercəkləşdi deməklə, bu düşüncəsini təşbehlə, qapalı istiarə, tənasüb sənəti, həmən bir kəs tərəfindən bilinən bir qissəyə deyildiyi üçün də təlmih sənəti adlana bilər.

Türk əbəbiyyatşünaslığına Şeyx Qalib yaradıcılığının araşdırılması həmişə diqqət mərkəzində olmuşur. Bu mövzu həmişə aktuallıq kəsb edərək başqa sənət sahələrinə də srayət etmiş, əlaqəli şəkildə araşdırılmaya cəlb olunur.

Azərbaycan ədəbiyyatşünaslığında Şeyx Qalibin adına ilk dəfə 1965-ci ildə M.Quluzadənin "Füzulinin lirikası" adlı monoqrafiyasında rast gəlirik. Tədqiqatçı Məhəmməd Füzulinin təsəvvüf görüşlərindən danışarkən Şeyx Qalibin lirik poeziyası ilə müqayisələr aparır. Məhəmməd Füzulinin təsəvvüfi baxışlarında dövrün çətinlikləri daha real həqiqətləri əks etdirməsini önə çəkilirsə, Şeyx Qalibdə tədqiqatçı bunların daha çox mistik mahiyyətində olduğunu vurğulayır. M.Quluzadə "Leyli və Məcnun" poeması ilə Şeyx Qalibin "Hüsn və Eşq"əsərini müqayisə edərək belə nəticəyə gəlir ki, hər iki əsərin mövzusu,ideya və kompozisiyası bir-biri ilə sıx bağlıdır.Onlar eyni mənbədən götürülüb (Quluzadə, 2008: 76).

Sonra isə Azərbaycan ədəbiyyatında Aydın Abıyev tərəfində yazılan "Füzuli və Türkiyə poeziyası" (2002) adlı monoqrafiyasında da iki şairin poetik düşüncələrinin müqayisələrinə rast gəlmiş oluruq. Burada müəllif hər iki şairin yaşayıb-yaratdığı dönəmin xarakteristikasını verir. Bu şairləri yetirən mühit haqqında geniş təsəvvür yaradır. Aydın Abıyev Şeyx Qalib poeziyasının Türk təsəvvüf ədəbiyyatında özünəməxsus yerindən, onun sonrakı dönəmlərindəki rolundan bəhs edib.

Daha sonra Şeyx Qalibin yaradıcılığı haqqında Aydın Abinin "Türkiyə ədəbiyyatı tarixi" (2005) dərsliyində şairin həyat və yaradıcılığı haqqında poertret oçer kimi məlumat vermiş, sonra Füzuli yaradıcılığı ilə yığcam müqayisə apararq hər iki şairin yaradıcılığında lirik .eirlərin əsas rol oynadığını göstərmişdir.

Şeyx Qalib yaradıcılığının araşdırılmasına Xuraman Hümmətovanın tədqiqatlarında rast gəlirik. O, ayrı-ayrı məqalələrində təsəvvüfün Qalib poeziyasındakı rolunu müxtəlif qəzəllərinin təhlilində araşdırıb. Müəllif məqalələrində təsəvvüfin orta əsr poeziyasında bir elm kimi öyrənildiyini qeyd edir, onun şairlərin yaradıcılığına verdiyi təsir gücündən söz açır. Təsəvvüfün poetik imkan genişliyinin təzahür formalarını Qalib qəzəllərinin təhlilində əks etdirir.

## Nəticə

Yekun olaraq onu deyə bilərəm ki, şairin yaradıcılığında Mövlanadan təsirlənməsindən, onun "Məsnəvi"sindən ilhamlanaraq şeirlər yazmasından, mövləvilik təriqəti ilə bağlılığından, müxtəlif mövləvixanalardakı fəaliyyətindən danışılır. Sonra Şeyx Qalibin III Səlimin sarayında yaşamasından və sultanın ona himayədarlığı haqqında məlumat verilir. Həmçinin şairin divanında özündən əvvəl yaşayıb-yaratmış həm Türk, həm də Azərbaycan şairlərinə həsr etdiyi şeirlərdən söz açılır.

## Ədəbiyyat

1. Cancelik, A. (2017). Ottoman scholars. Shayx Qalip. Istanbul: I nəşr, İlke Publication.
2. Cipan, M. (2016). The manifestations of the "Three Selims" embodied in the "Cile" Shahrah of Mevlevism in our reign, literature and music. Marijuana Love. Articles and bibliography about Sheikh Qalip. Prepared by Hanife Koncu, Müjğan Çakır, Leyla Alptekin Sarıoğlu. I

edition, Istanbul: Dərgah Publishing.
3. Dede, E. (2000). Tezkire-i Şüeraq-yi Mevleviyye. Ankara: Akaturk Cultural Center Publications.
4. Doghan, A. (2016). "Şeyx Qalibin "Falled" rədifli qəzəlindəki imgələr onərində". His work - Love. Articles and Bibliography about Sheikh Qalib. Anchor prepared by: Hanifə Koncu - Müjgan Çakır and Leyla Alptekin Sarıoğlu) İstanbul: Beylikdüzü.
5. Erdogan, T. (2009). Ismayil Rusuhi Ankaravi's Mesnevi Commentary (Mecmu atül - Letaif ve Matmuratül Maarif) Volume, Transcription-Review. Marmara University Institute of Turkic Studies, Unpublished Doctoral Thesis, Istanbul.
6. Eseri – Ask. (2016). Articles and Bibliography about Sheikh Qalib. anchor prepared by Hanifə Koncu – Müjgan Çakar and Leyla Alptekin Sarıoğlu. Erdogan Tastan. Mevlevi elders in Sheikh Qalib poems. Istanbul: Beylikdüzü publishing house.
7. İslam Ensklopediyası. (1980), Ankara.
8. Karaman, G. (2019). "Fuad Koprulu'nun An Evaluation of His Writings on Sheikh Galib", Blue Atlas, 7(1).
9. Kut, G. (2016). Sheikh Qalip and ötkiler. Marijuana Love. Articles and bibliography about Sheikh Qalip. Prepared by Hanife Koncu, Müjğan Çakır, Leyla Alptekin Sarıoğlu. I edition, Istanbul: Dərgah Publishing.
10. Quluzadə, M. (2008). Füzulinin lirikası.Bakı: AMEA Nəşriyyatı,Bakı:Oğuz eli nəşriyyatı. II nəşr
11. Nihat, T. (1985). Füzuli Divanın Şərhi. Üç ciltdə I c. Ankara: Baş nazirin mətbuat xidməti.
12. Qalib, Ş. (2011). Divan. Hazırlayan: Naci Okcu. I nəşr, Ankara: Diyanet Vekfi nəşrləri.
13. Tulucu, S. Some bibliographic notes on Sheikh Galib. Journal of Atatürk University Faculty of Theology, Issue: 36 p.

Gönədərildi: 17.05.2022 Qəbul edildi: 03.07.2022

QƏDİM DİYAR Beynəlxalq onlayn elmi jurnal. İmpakt Faktor: 0.652. 2022 / Cild: 4 Sayı: 7 / 34-37 ISSN: 2706-6185
ANCIENT LAND International online scientific journal. Impact Factor: 0.652. 2022 / Volume: 4 Issue: 7 / 34-37 e-ISSN: 2709-4197

DOI: https://doi.org/10.36719/2706-6185/13/34-37

**Elvin Elçin oğlu Mirzəyev**
Bakı Dövlət Universiteti
magistrant
elvin.mirzayev.1999@gmail.com

# DEPOZİT HAQQINDA NƏZƏRİ BAXIŞLAR VƏ KOMMERSİYA BANKLARININ HƏYATA KEÇİRDİKLƏRİ DEPOZİT SİYASƏTİNİN ƏHƏMİYYƏTİ

**Xülasə**

Bankın depozit siyasətinin mahiyyətinə nəzər saldıqda, əmanət siyasətinin obyektləri və subyektləri, onun formalaşmasının real prinsipləri, depozit siyasətinin hüdudları kimi məsələlərə toxunmaq lazımdır. Təcrübədə hər hansı bir kommersiya bankının depozit siyasətinə aşağıdakı elementlər daxildir:

1) müştərilər
2) hökumət
3) kommersiya qurumları.

Əmanət siyasəti kreditorlara müvəqqəti sərbəst vəsaitlərin yerləşdirilməsindən, o cümlədən kommersiya banklarının aktiv əməliyyatlarda istifadə üçün mövcud olan resurslardan səmərəli istifadə etmək imkanlarından faydalanmasına yönəlmişdir. Kommersiya bankının depozit siyasəti aşağıdakı tələblərə cavab verməlidir:

1) iqtisadi baxımdan məqsədəuyğunluq
2) rəqabət qabiliyyəti
3) daxili ziddiyyətlərin olmaması.

***Açar sözlər:*** *əmanətlər, kommersiya bankı, kredit siyasəti, inkişaf, aktiv əməliyyatlar, passiv əməliyyatlar, siyasət*

**Elvin Elchin Mirzayev**
Baku State University
master student
elvin.mirzayev.1999@gmail.com

## Theoretical views about deposit and the importance of deposit policy implemented by commercial banks

**Abstract**

When looking at the essence of the deposit bank policy, it is necessary to touch on issues such as theobjects and subjects of the deposit policy, the real principles of its formation, and the limits of the deposit policy. In practice, the deposit policy of any commercial bank includes the following elements: customers, government and commercial institutions. Savings policy is aimed at the placement of temporary free funds to creditors, as well as the ability of commercial banks to effectively use the resources available for usein active operations. The deposit policy of a commercial bank must meet the following requirements:

1) expediency from an economic point of view
2) competitiveness
3) lack of internal contradictions

***Keywords:*** *deposits, commercial banking, credit policy, development, active operations, passive operations, politics*

## Giriş

Depozit və ya bank əmanəti – əmanətçi ilə bank arasında imzalanmış müqavilə ilə müəyyən olunan müddətə və faiz dərəcələri müqabilində hüquqi və ya fiziki şəxslərin (əhalinin) bankda yerləşdirdiyi sərbəst pul vəsaitidir. Nəticədə bank bu pulları dövriyyəyə buraxır, onları kredit

şəklində istifadə edir, əmanətçilər isə öz pul vəsaitlərindən istifadə etməyə imkan verdikləri üçün bankdan razılaşdırılmış civarda faiz əldə edirlər. Bir qayda olaraq iqtisadçılar depozitləri müddətinə, faizlərin hesablanmasına, vəsaitin çıxarılması və əlavə edilməsi imkanlarına görə 2 yerə ayrılır (Abdullayev, Əsgərova, 2009):

1) Müddətli depozit - Müqavilə əsasında razılaşdırılmış müddətdə bankda yerləşdirilir və həmin müddət üçün faiz dərəcələri hesablanır. Vəsaiti vaxtından əvvəl hesabdan götürdükdə faizlərin bir hissəsini itirmək mümkündür.

2) Tələbli depozit - Müştəri öz vəsaitini qeyri müəyyən müddətə bankda yerləşdirir və istədiyi anda bankdan çıxara bilir. Belə məbləğlərə ya ümumiyyətlə faiz hesablanmır, ya da inflyasiyaya uyğun faizlər hesablanır.

Müddətinə görə depozitlər 2 yerə bölünür (Aslanov, 2014):

1) Qısa müddətli əmanətlər
2) Uzun müddətli əmanətlər

Qısamüddətli depozitlərin qüvvədə olma müddəti adətən 6 ayı ötmür, uzun müddətlilər isə bir neçə ili, hətta onillikləri də əhatə edə bilər. Qeyd etmək lazımdır ki, adətən depozitin müddəti nə qədər çox olarsa, hesablanan faizlər də daha yüksək olmalıdır. Daha bir vacib məqam isə odur ki, müqavilənin müddəti başa çatarsa və əmanətçi nə əsas məbləği, nə də ona hesablanmış faizləri götürməyə gəlməzsə və müqavilədə xüsusi hallar nəzərə alınmayıbsa onda əmanətin müddəti avtomatik olaraq eyni şərtlərlə uzadılır (Məmmədov, 2008):

Pul vəsaitlərinin hesabdan çıxarılması imkanlarına görə depozitlər 3 yerə bölünür:

1) Tələbli depozitlər – bu ən aşağı faiz dərəcəsi ilə olan depozit növüdür, mahiyyət etibarı ilə sadəcə pulu saxlamaq üçün banka ötürürülür, lakin bu zaman bankda depozit qutusunu kirayələmir və onun üçün xidmət haqqı ödənilmir, həmçinin cüzi də olsa bankdan öz vəsaitlərini istifadə etməyə imkan verdiyinə görə faizlər qazanırlar. Bu depozit növünün əsas üstünlüyü qoyulan məbləği heç bir məhdudiyyət olmadan istənilən vaxt çıxarmaq imkanının olmasıdır.

2) Müddətli depozit - əmanətçilər üçün ən sərfəli depozit növüdür, bu zaman bank əmanətçiyə maksimal faiz dərəcəsi təklif edir. Amma bu halda əmanətçi lazımı məbləği heç bir faiz itkisi olmadan istənilən an hesabdan çıxarmaq imkanına malik olmur.

3) Minimal azaldıla bilməz qalıqlı depozitlər – bu kombinasiya edilmiş formadır, tələbli və müddətli depozit arasında orta mövqeyə malikdir. Bir qayda olaraq, belə bir depozit məhsulundan istifadə zamanı əmanətçi hesab açır və yerləşdirdiyi depozit məbləğinin müəyyən hissəsini müqavilədə göstərilən müddət ərzində hesabdan çıxara bilməz.

**Əhalinin banklardakı əmanətləri (www.stat.gov.az)**

| | 2014 | 2015 | 2016 | 2017 | 2018 | 2019 | 2020 | 2021 |
|---|---|---|---|---|---|---|---|---|
| Əhalinin Banklardakı əmanətləri | 7188.4 | 9473.9 | 7448.7 | 7561.2 | 8375.4 | 8637.9 | 8177.9 | 9241.5 |
| Milli valyuta ilə | 4422.4 | 1420.2 | 1517.3 | 5028.3 | 3142.2 | 4132.7 | 4027.1 | 5452.2 |
| Xarici Valyuta ilə | 2766 | 8053.7 | 5931.4 | 2532.9 | 5233.2 | 4505.2 | 4150.8 | 3789.3 |
| Əmanətlərin artımı faizlə | 112.4 | 131.8 | 78.6 | 101.5 | 110.8 | 103.1 | 94.7 | 113 |

Banka əmanətlərin yerləşdirilməsinə görə əmanətçiləri 2 qrupa ayırmaq olar (Bağırov, 2003):

1) Fiziki şəxslərin əmanətləri
2) Hüquqi şəxslərin əmanətləri

Kredit təşkilatlarının depozit əməliyyatları fiziki və hüquqi şəxslərin müəyyən müddətə və ya tələbə qoyulmuş əmanətlərə yönəldilmiş vəsaitlərinin, o cümlədən investisiya fəaliyyəti üçün kredit mənbəyi kimi istifadə edilməsi üçün əmanətçilərin hesablaşma hesablarındakı qalıqların cəlb edilməsinə yönəlmiş əməliyyatlardır. Depozit - müəyyən şərtlərlə saxlanması üçün həqiqi sahibi tərəfindən kredit təşkilatına verilən milli və xarici valyutada ifadə olunan pul vəsaitlərini təmsil edir (Mişkin, Teas-Press, 2021).

Depozit siyasəti aşağıdakı aspektləri əhatə etməlidir:

1) ətraf mühitin təhlili, vəsaitlərin toplanması, mümkün problemlərin proqnozlaşdırılması və diaqnostikası sahəsində bankın rolu və yeri də daxil olmaqla hərtərəfli bazar araşdırmasına əsaslanaraq, bankın əmanətlər üçün vəsait toplama fəaliyyətlərini həyata keçirmək strategiyasının hazırlanması alqoritmi.

2) əsas müştəri bazasına yönəldilmiş innovativ əmanət məhsullarının inkişafı, təklif edilməsi və təşviqi sahəsində bankın taktikasının formalaşdırılması prosesi

3) hazırlanmış taktika və strategiyaların praktikada tətbiqi

4) hazırlanmış siyasətin həyata keçirilməsinə və səmərəliliyinə nəzarət etmək

5) Bankın vəsait toplamağa yönəlmiş fəaliyyətini müntəzəm olaraq izləmək (Mikayılov, 2013).

Kommersiya banklarında vəsait toplama prosesini tənzimləyən əsas sənəd bankın depozit siyasətidir. Bu sənəd hər bir kommersiya təşkilatı tərəfindən müstəqil şəkildə hazırlanır və strateji bir plana, işləmə quruluşunun və söz mövzusu bankın maddi bazasının vəziyyətinin təhlilinə əsaslanır. Bu vəziyyətdə yuxarıda göstərilən bütün tədbirlər əmanət siyasətinin özünün inkişaf perspektivlərinə uyğun məqsədlər üçün tətbiq olunur (Məmmədov, 2003).

Kommersiya bankı tərəfindən əmanətlərin cəlb edilməsi müddəti bir sıra səbəblərə görə ola bilər. Daha çox dərəcədə bu şərtlər tələb olunan ehtiyatların formalaşması ilə bağlı banklararası qanunvericiliyə bağlıdır, yəni borc ehtiyatlarının şərtlərindən asılı olaraq tələb olunan ehtiyat normalarının fərqlənməsi mövcuddursa, kredit təşkilatı ödənişlərin minimum standartlara uyğun aparılmasına imkan verən şərtləri seçir (Rudiy, 2009). Kommersiya bankları tərəfindən aparılan aktiv əməliyyatların vaxtı müəyyən şərtlərin seçilməsinə böyük təsir göstərir. Həm də kredit təşkilatları tərəfindən pul qaynaqlarının cəlb edilməsi vaxtı cari pul bazarında mövcud meyllərdən və bazar tələbi və təklifindəki dəyişkənliklərdən birbaşa asılıdır. Müddətli əmanət sahibinin yalnız əvvəlcədən razılaşdırılmış müddət bitdikdən sonra istifadə edə bilməsi, öz pulunu kommersiya bankından erkən almağına mane olmur. Lakin bu və ziyyətdə müştəri əmanət üzrə faizlərinin bir hissəsini itirir. Kredit təşkilatı müvəqqəti əmanətlərin cəlb edilməsində maraqlıdır, çünki onlar yüksək dərəcədə sabitliyə malikdirlər və kommersiya bankına əmanətçilərin vəsaitlərini kifayət qədər uzun müddətə saxlamağa imkan verirlər (Məmmədova, 2009).

Kommersiya banklarının depozit siyasətinin formalaşması:

1) Məqsədləri təyin etmək və depozit siyasətinin məqsədlərini müəyyənləşdirmək
2) Müvafiq şöbələrin bölüşdürülməsi və bank işçilərinin səlahiyyətlərinin bölüşdürülməsi
3) Resursların cəlb edilməsi üçün zəruri prosedurların hazırlanması
4) Depozit əməliyyatları prosesində nəzarətin və idarəetmənin təşkili

Hər hansı bir kommersiya bankının depozit siyasətinin formalaşdırılması həm konkret, həm də ümumi prinsiplərə əsaslanır. Kommersiya bankı göstərilən prinsiplərə əməl edirsə, bu, müvəffəqiyyət qazanmaq şansları olan əmanət prosesi çərçivəsində taktiki və strateji istiqamətləri formalaşdırmağa imkan verir (10). Depozit siyasətinin ümumi prinsipləri həm makroiqtisadi səviyyədə həyata keçirilən Mərkəzi Bankının dövlət pul siyasətində, həm də hər bir kommersiya bankında tətbiq olunan prinsiplər hesab olunur. Təcrübədə, bunlara kommersiya bankının depozit siyasətinin bütün elementlərinin siyahısına inteqrasiya olunmuş yanaşma, optimallıq və səmərəlilik, elmi sağlamlıq və birlik prinsipləri daxildir (Bəşirov, 2016).

Depozit siyasətinin ümumi prinsipləri:

1) Elmi əsaslandırma prinsipi
2) Ardıcıllıq və effektivlik prinsipi
3) Elementlərin vəhdəti prinsipi
4) Vahid yanaşma prinsipi

Depozit siyasətinin xüsusi prinsipləri (Muxtarov, 2013):

1) Optimal xərclərin səviyyəsini təmin etmək
2) Bank əməliyyatlarının təhlükəsizliyi

Praktikada ümumiyyətlə kommersiya bankının depozit siyasəti fiziki və hüquqi şəxslərin müvəqqəti sərbəst vəsaitlərinin toplanması üçün xüsusi icazə verilən həddi kimi başa düşülür. Üstəlik, bir sıra aşağıdakı xüsusiyyətlər üçün bu həddin təsnifatı mövcuddur (Sadıqov, 2003):

1) depozit bazarında tələb və tələbdən asılı olaraq;
2) kommersiya bankının Mərkəzi Bank qaydaları və hədlərinin faktiki təsiri barədə
3) mövcud depozit münasibətlərinin subyektlərindən asılı olaraq

4) əmanət münasibətlərinin aktuallığından asılı olaraq
5) coğrafi prinsipdən asılı olaraq
6) cəlb edilmiş vəsaitin quruluşundan və həcmindən asılı olaraq

## Nəticə

Bankın depozit siyasətinin formalaşması mərhələlərindən hər hansı biri digərləri ilə birbaşa əlaqəlidir və optimal depozit siyasətinin və əmanət prosesinin səlahiyyətli təşkili üçün zəruri olan zəruri elementdir. Bank üçün qarşıya qoyulan vəzifələrin uğuru və əmanət siyasətində qarşıya qoyulan məqsədlərə çatmaq, göstərilən prosesin real effektivliyindən çox asılıdır. Ümumiyyətlə banklarda aktivlər depozit əsasında formalaşır (14). Banklar cəlb etdikləri depozitləri aktivlərə yerləşdirərək mənfəət əldə edirlər. Beləliklə, belə bir nəticəyə gələ bilərik ki, əhalinin və təsərrüfat subyektlərinin müvəqqəti əmanətləri aktiv xarakterli əməliyyatlar aparmaq üçün istifadə olunan kommersiya banklarının mənfəət əldə etməsində ən vacib amildir. Əmanətçilər üçün əmanət nağd puldan faiz dərəcəsi ilə fərqlənir (15).

## Ədəbiyyat

1. Abdullayev, Ş., Əsgərova, K. (2009). Bank işi. Bakı.
2. Aslanov, A. (2014). Maliyyə və bank statistikası. Bakı.
3. Məmmədov, Z. (2008). Beynəlxalq valyuta-kredit münasibətləri və xarici ölkələrin pul-kredit sistemi. Bakı.
4. Bağırov, M. (2003). Bank işi. Bakı.
5. Mişkin, F. (2021). Pul, Bank və maliyyə bazarlarının iqtisadiyyatı. Bakı.
6. Mikayılov, Q. (2013). Azərbaycan Bank sisteminin maliyyə analizi. Bakı.
7. Məmmədova, N. (2009). Maliyyə və Kredit. Bakı.
8. Rudiy, K. (2009). Xarici ölkələrin maliyyə-kredit sistemi. Bakı.
9. Məmmədov, Z. (2003). Bank işi və e-bankçılıq. Bakı.
10. www.cbar.az
11. Bəşirov, R. (2016). Bank işi. Bakı.
12. Sadıqov, M. (2003). Xarici ölkələrin pul-kredit sistemi. Bakı.
13. Muxtarov, Ş. (2013). Azərbaycan Bank sisteminin maliyyə analizi. Bakı.
14. www.stat.gov.az
15. www.economy.gov.az.

Göndərildi: 22.05.2022 Qəbul edildi: 16.07.2022

DOI: https://doi.org/10.36719/2706-6185/13/38-42

**Ülfət İltifat qızı Vəliyeva**
Azərbaycan Dövlət Pedoqoji Universiteti
magistrant
ulush99@mail.ru

# GƏNCLƏRİN TƏHSİLİNDƏ SOSİAL FƏALİYYƏTİN ROLU

**Xülasə**

Bu məqalədə təhsilin gənclərin fəaliyyətində və inkişafında rolundan bəhs olunur. Gənclərin sosial fəaliyyətləri əks olunur. Onların təhsilinə təsir göstərən sosial amillər qeyd edilir. Təlimlərin, layihələrin, seminarların gənclər üçün üstünlükləri burada öz əksini tapır.

Gənclərin könüllülük fəaliyyətlərindən bəhs olunur. Bu fəaliyyətin gənclərin inkişafında rolundan bəhs edilir. Həmçinin gənclərin təhsillə bağlı ölkə xaricində yay kurslarında iştirakı da qeyd edilir. Xüsusilə gənclərin təhsilində sosial fəaliyyətlərin rolu, əhəmiyyəti əks olunur.

***Açar sözlər:*** *gənclər, təhsil, inkişaf, sosial, fəaliyyətlər*

**Ulfat Iltifat Valiyeva**
Azerbaijan State Pedagogical University
master student
ulush99@mail.ru

## The role of social activity in the education of young people

**Abstract**

This article talks about the role of education in the activities and development of young people. Thesocial activities of young people are reflected. The social factors affecting their education are noted. Theadvantages of training, projects, seminars for young people are reflected here.

The voluntary activities ofyoung people are discussed. The role of this activity in the development of young people is discussed.Also the attendance of young people in summer school abroad is mentioned here. The role and importance of social activities in the education of young people is especially reflected.

***Keywords:*** *young people, education, development, activities*

## Giriş

Bugün müasir dövrümüzdə gənclər dövlətin sosial-iqtisadi, siyasi həyatında mühüm rol oynayır. Gənclər hər bir cəmiyyətin ən fəal nümayəndələrindəndir. Ölkənin inkişafı birbaşa savadlı gənc kadrlardan aslıdır və dövlətimiz savadlı gənc kadrların yetişdirilməsinə və inkişafına xusüsi önəm verir. Belə ki, gənclərin inkişafı ilə bağlı bir sıra proqramlar, layihələr qəbul edilmişdir. Belə Dövlət proqramlarında gənclərin təhsili, sosial fəaliyyətləri, cəmiyyətin sosial-iqtisadi və siyasi həyatında iştirakı ilə bağlı bır sıra məsələlər öz əksini tapmışdır. Həmçinin Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərancamı ilə həyata keçirilən gənclər siyasəti gənclərin inkişafında, fəallığında mühüm addım kimi qəbul edilə bilər. Umumiyyətlə hər bir gəncin sosial fəalliyyəti onun inkişafında, təhsilində mühüm rol oynayır. Gəncliyin inkişafı ilə bağlı qəbul edilən 2005-2009-cu illər, 2011-2015 və 2017-2021-ci illər üzrə Dövlət proqramlarında da öz əksini tapan əsas məsələlərdən də biri məhz elə gənclərin təhsili, sosial fəaliyyətləri və təhsilində sosial fəaliyyətlərin rolu olmuşdur. 2007-ci ilin "Gənclər ili" elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 9 fevral 2007-ci il tarixli sərancamı ilə gənclərin ölkə həyatındakı fəallığının, sosial fəaliyyətlərinin daha da artırılımasına səbəb oldu (Cəfərov, 2012: 9-10). Gəncliyin inkişafı ilə bağlı Dövlət proqramlarına əsasən Bakıda Gənclər Mərkəzinin, regionlar da isə Gənclər Evləri yaradılmışdır və burada gənclər bir sıra layihə, seminar və təlimlərdə iştirak edərək özlərini inkişaf etdirmişlər. Umumiyyətlə onu qeyd etmək lazımdır ki, yüksək rifaha çatmaq istəyən hər

bir gənc daim öz üzərində işləməli, bır sıra sosial fəaliyyətlərdə daima iştirak etməlidir. Həmçinin əvvəlki təhsil sistemlərindən fərqli olaraq bugün orta məktəblərdə də gənclər daha çox sosial fəaliyyətlərə cəlb olunurlar. Xüsusilə gənclər də intelektual səviyyənin, nitqin,məntiqin inkişafı üçün sosial fəaliyyətlər önəmlidir. Gənclərin sosial fəaliyyətləri yalnız onların təhsilində deyil, dünyagörüşünün inkişafında, müstəqil olaraq fikrinin formalaşmasında və cəmiyyətdə fəal mövqe tutmasında da mühüm rol oynayır (2).

Hər bir gəncin cəmiyyətdə fəal mövqe tutması ilə bağlı həyata keçirilməli əsas işlərdəndə biri məhz elə onların təhsilində sosial fəaliyyətlərə daha çox diqqət yetirilməsidir. Sosial fəaliyyətlər geniş və müxtəlif olub, hər bir gənc üçün bu fəaliyyətlərin mühüm üstünlükləri vardır. Gənclərin yaradıcılığının, fərdi qabiliyyətlərinin üzə çıxarılmasında mühüm rol oynayan sosial fəaliyyətlər onların təhsilinin ayrılmaz, əsas tərkib hissəsidir. Həmçinin ölkə daxili sosial fəaliyyətlərlə yanaşı, təbii ki, ölkə xarici sosial fəaliyyətləri də qeyd etmək lazımdır. Gənclərimiz ölkə xarici sosial fəaliyyətlərdə iştirak etməklə müəyyən sahədə təcrübə qazanır, digər ölkə vətəndaşları ilə əlaqə qurur, önəmli biliklər əldə edir və umimilikdə müsbət nəticələr əldə edirlər (3). Gənclərin təhsilində mühüm rol oynayan sosial fəaliyyətlərə gənclərin təlim, seminar, layihə, düşərgələrdə iştirakı və həyata keçirilən görüşlər, tədbirlər aid edilə bilər. Hər bir gənc üçün həyata keçirilən təlimlər mühüm əhəmiyyət kəsb edir. Təlimlər gənclərin gerçəkliyi dərk etmə yolundakı hərəkəti ilə bağlıdır. Təlim bilik-bacarıq, vərdişlərin, dünyagörüşünün verilməsi və mənimsənilməsi prosesidir. Təlimin təşkilində mənimsəməni təmin edən mühitin yaradılması mühüm əhəmiyyət kəsb edir. Təhsil təlimləri gənclərin peşə bacarıqlarını artırmaq üçün istifadə olunur və praktik tələblərin yerinə yetirilməsinə uyğunlaşmağa kömək edir (4). Ümumiyyətlə təhsillə bağlı təlimlər düşünürəm ki, hələ orta məktəb dövründən keçirilməyə başlanılmalıdır. Belə təlimlər də şagirdlərin gələcəkdə seçmək istədikləri ixtisaslarla bağlı onlara ətraflı məlumatlar verilməlidir. Çünki çox təəssüf ki, şagirdlərin bir çoxu seçmək istədiyi ixtisasın mahiyyətini tam dərk etmədən təki qəbul olum düşüncəsi ilə həmçinin valideynlərinin, tanışlarıının təkidi ilə bəzən səhv ixtisas seçimi edir. Bu da təbii ki, son da şəxsin bitirdiyi ixtisası istifadə edə bilməməsi və onun işsiz qalmasına gətirib çıxara bilir. Buna görə də yaxşı olar ki, orta məktəb dövründən hələ şagirdlər müəyyən təlimlərə cəlb edilsin və şübhəsiz ki, bu təlimlər onların gələcək inkişafında mühüm rol oynayacaqdır. Həmçinin təlim prosesi zamanı şagirdlər də həm idraki, həm də praktik bacarıq və vərdişlər yaranır, tədricən inkişaf edərək formalaşır (Bədəlova, 2015: 71-72). Təlimlər şagird və gənclərin müəyyən sahəyə istiqamətlənməsində də mühüm rol oynayır. Belə ki, təhsillə bağlı keçirilən təlimlər zamanı gənclər təhsilin müxtəlif sahələri ilə bağlı ətraflı məlumat əldə edə bilir ki, bu da onun özünə uyğun sahəni seçməsində ona kömək olur. Onu da qeyd etmək olar ki, keçirilən təlimlərin gənclərimiz üçün ən mühüm üstünlüklərindən biri odur ki, təhsillə bağlı bəzən gənclərimiz müəyyən məsələləri internet vasitəsi ilə araşdırdıqda bəzən onlara qaranlıq qalan məqamlar olur, təhsillə bağlı keçirilən təlimlərdə isə gənclərə bütün məlumatlar detallı şəkildə izah edilir, onlar müxtəlif suallar verərək, həm bu məsələylə bağlı biliklərini genişləndirir, həm də onlara qaranlıq qalan bütün suallara cavab tapmış olurlar. Onu da vurğulamaq lazımdır ki, bugün ki, günümüzdə bəzi insanlar təhsil ilə bağlı yeni məlumatlar əldə etmək istəyirlər, lakin bunun üçün internetdən istifadə imkanları olmur, bu zaman təlimlər vasitəsi ilə onlar təhsil sahəsi ilə bağlı maariflənə bilərlər. Həmçinin karyera seçimi ilə bağlı keçirilən təlimlər bugün gənclərimiz üçün daha çox effektivdir. Çünki gənclərin ən aktual problemlərindən biri də elə işsizlikdir, bəzən bu təlimlərdə pulsuz təcrübə proqramları, onların şərtləri haqqında məlumat verilir, bununla yanaşı işə götürülmə meyarları, real işçiyə çevrilmə faizləri göstərilir. Gənclərimiz üçün təhsillə bağlı keçirilən təlimlərin əsas müsbət tərəfi də ondan ibarətdir ki, gənclər təhsilə sahəsində həyata keçirilən yeniliklər haqqında ətraflı məlumatlar əldə edə bilir və bu yeniliklərdən agah olurlar (6).

Pandemiya dövründə distant təhsillə bağlı da bir sıra universitetlər də təlimlər keçirilmişdir. Belə təlimlərə Azərbaycan Dövlət İqtisad Universiteti və Qərbi Kaspi Universitetinin rəhbərliyi altında keçirilən təlimləri göstərə bilərik. Bu təlimlər də müvafiq olaraq gənclərə distant təhsilin təşkili, üstünlükləri, aktuallığı, texnologiyası haqqında ətraflı məlumat verilmişdir. Belə təlimlər gənclərin distant təhsillə bağlı ətraflı məlumatlandırılmasında mühüm rol oynamışdır. Təlimlər də həmçinin yalnız gənclər deyil, bır sıra yaş qrupuna aid insanlar iştirak etmişlər. Belə ki, pandemiya dövründə gənclərimizin əksəriyyəti online təlimlərdə iştirak etmişlər, belə təlimlər gənclərin boş vaxtının səmərəli keçirilməsində, həmçinin qazanılmış biliklərin daha da zənginləşməsində və dünyagörüşünün genişlənməsində özünəməxsus rol oynamışdır. Online şəkildə ictimai həyatın müxtəlif sahələrinə aid keçirilən bu təlimlərin gənclərin inkişafında, təhsilində rolu əvəzsizdir. Belə təlimlərə Tələbələr üçün Yay İnkişaf Proqramı adlı təlimi, İctimai Danışıqlar, Tələbələr üçü İş Yerində Effektivlik adlı təlim və bir sıra başqa təlimləri qeyd edə bilərik (4). Həmçinin gənclər üçün universitetdə təhsil aldığı ixtisasla

bağlı təlimlər təşkil edilməlidir, hansıki belə təlimlər də gənclər praktiki bacarıqlar əldə etməli və ixtisasıyla bağlı onun üçün qaranlıq qalan suallara cavab tapmalıdır. Belə təlimlərin təşkili hər bir gəncin öz ixtısasına dərindən yiyələnməsində, təhsilində, cəmiyyət üçün savadlı kadr kimi formalaşmasında düşünürəm ki, əsas addımlardan biridir. Umumiyyətlə təlimlər gənclərin təhsilə marağının artırılmasında mühüm rol oynamaqla yanaşı, həmçinin təlimlər də gənclərin ünsiyyət bacarıqları inkişaf edir, sosial əhatələri genişlənir və yeni dünyagörüşü qazanırlar (7).

Gənclərin seminarlar da iştirakı da sosial fəaliyyət kimi qəbul edilə bilər. Müasir dövrümüzdə ən aktual sahələrdən biri olan təhsil sahəsiylə bağlı müxtəlif seminarlar keçirilir. Bu seminarlar böyük kütlə üçün nəzərdə tutulmalı və əhalinin marağını cəlb etməlidir. Müxtəlif müəssisələr tərəfindən keçirilən bu seminarların da təbii ki, gənclərə faydası az olmamışdır. Belə ki, bir qrup gənclərimiz xarici ölkələrdə təhsil almağa üstünlük verir və xarici ölkədə təhsillə bağlı təşkil edilən bır sıra seminarlar da iştirak edirlər. Bu seminarlar da gənclər xaricdə təhsil, onun üstünlükləri,əhəmiyyəti barədə maarifləndirilir. Belə seminarlar zamanı gənclər tərəddüd etdiyi məsələlərə asanlıqla aydınlıq gətirə bilir. Ümumiyyətlə keçirilən bu seminarlar gənclərin inkişafında, təhsilində mühüm rol oynayır. Həmçinin onu da qeyd etmək lazımdır ki, universitetlərdə də tələbələrin təhsil aldığı ixtisasla bağlı seminarların keçirilməsi mühüm addım kimi dəyərləndirilə bilər. Bu seminarlar gənclərimizə ixtisası ilə bağlı daha geniş biliklər əldə etməyə, həmçinin öz biliklərini daha da genişləndirməyə şübhəsiz ki, çox böyük kömək olacaqdır.Düzgün peşə, karyera seçimi ilə bağlı keçirilən seminarlara da geniş yer verilməlidir, çünki peşə seçimi hər bir gəncin həyatında önəmli rol oynayır. Gələcəkdə seçilən peşə ilə bağlı peşmanlıq duymamaq üçün yaxşı olar ki,gənclərimiz təhsil, düzgün peşə, karyera seçimi ilə bağlı seminarlar da iştirak etsinlər (8).

Bir çox universitetlər də olduğu kimi Azərbaycan Dövlət Dillər Universitetində isə "Çində təhsilin xüsusiyyətləri və ali təhsil sistemi"mövzusunda seminar təşkil edilib. Bu seminar da Çində müasir ali təhsil sistemi, qəbul tələbləri və ölkənin ali məktəblərinə sənəd qəbulu prosesindən, xarici tələbələr üçün təqaüd və qrant növləri ilə bağlı çıxışlar edilmişdir. Belə ki, seminarı təşkil edən şəxslər Çində praktiki iş bacarıqları əldə etmək imkanlarından, həmçinin çin dili kursları haqqında ətraflı məlumat vermişdir. Həmçinin seminar nəticəsində əldə olunan məlumatlara əsasən son illər Çin universitetlərində təhsil alan azərbaycanlı tələbərinin sayının artdığı və təqaüd proqramlarının mübadiləsinin genişləndiyi məlum olmuşdur. Beləliklə, bu seminar Çində təhsil almaq istəyən tələbə gənclərimiz üçün olduqca əhəmiyyətli bir seminar olub, onların bu barədə maarifləndirilməsində mühüm rol oynamışdır. Umumiyyətlə fikrimcə keçirilən seminarların təhsil sahəsində ən mühüm əhəmiyyəti gəncləri maarifləndirmək, bəzən gizlində qalan diqqət yetirilməli məqamları üzə çıxartmaq, gənc nəsli güvənilir kadra, vətəndaşa çevirməkdir (9).

Gənclərin təhsilində sosial fəaliyyət kimi layihələrində rolu əvəzsizdir. İlk olaraq layihə-əvvəlcədən planlanmış büdcə və zaman çərçivəsində hər hansı hədəfə çatmaq üçün görülən işlərin cəmidir. Dövlətimiz gənclərin inkişafına xüsusi diqqət ayırır və onların inkişafı, təhsili ilə bağlı ölkəmizdə bir sıra layihələr irəli sürülmüşdür. Həmçinin gənclər tərəfindən irəli sürülən layihələr təhsildə mühüm rol oynayır. Lakin əfsuzlar olsun ki, bir sıra layihələr uğursuz olmuşdur. Bu layihələrin uğursuz olmasının əsas səbəbləri isə dövlətin gənc nəslə yetərincə dəstək olmaması, universitetlərdə lazimi qədər seminarların keçirilməməsi, valideynlərin laqeydsizliyi, gənclərdə motivasiya və yenilikçi maraqların azlığıdır. Layihələrin yazılması üçün ilk olaraq yaxşı olar ki, universitetlər də və digər müəssisələrdə bununla bağlı seminarlar, təlimlər keçirilsin. Belə seminarlar gənclərə layihələrdə düzgün mövqe tutmaqda yardımçı olacaqdır. Gənclər müəyyən layihə ilə çıxış etməmişdən öncə layihə təklifini hazırlamaq lazımdır. Layihənin ideyası, məqsəd və vəzifələri, icra müddəti, risklər, layihə çərçivəsində görüləcək işlər, büdcə nəzərə alınmalıdır. Ölkəmizdə həmçinin gənclərin inkişafı ilə bağlı bir sıra layihələr irəli sürülmüşdür. Belə layihələrə "Region Gənclərinin Müasir Bilik Akademiyası layihəsi Hamı Təhsil alsın" və "İdeyanı reallaşdır" layihəsi aid edilə bilər. Gənclər və İdman Nazirliyinin təşəbbüsü ilə də həmçinin gənclərin təhsili, inkişafı ilə bağlı bir sıra layihələr qəbul edilmişdir. Bu layihələr nəticəsində bir sıra gənclərimiz təhsil almaq və işlə təmin olunmaq imkanı əldə etmişdir. Gənclərimiz tərəfindən irəli sürülən layihələrə "Region gənclərinin sosial xidmətlərdən effektiv istifadə bacarıqlarının artırılması, Region gənclərinin İnternet resurslarından səmərəli istifadə etməklə karyera imkanlarının artırlması, Gənclər arasında sağlam həyat tərzinin təbliği. Tələbələrin karyera inkişafı və bir sıra başqa layihələr aid edilə bilər. Belə layihələr ilə çıxış edən gənclərimiz daima araşdırma edir və mövzu ilə bağlı kifayət qədər informasiya əldə edir, biliklərini zənginləşdirir və dünyagörüşünü genişləndirir (10).

Gənclər və İdman Nazirliyinin dəstəyi, İrəli İctimai Birliyinin təşkilatçılığı ilə Azərbaycan

QƏDİM DİYAR Beynəlxalq onlayn elmi jurnal. İmpakt Faktor: 0.652. 2022 / Cild: 4 Sayı: 7 / 38-42 ISSN: 2706-6185
ANCIENT LAND International online scientific journal. Impact Factor: 0.652. 2022 / Volume: 4 Issue: 7 / 38-42 e-ISSN: 2709-4197
Gənclərinə Dəstək-Könüllülər düşərgəsi adlı layihə irəli sürülmüşdür. Bu layihənin əsas məqsədi Azərbaycan da könüllülük ideyalarının aşılanması, vətəndaş cəmiyyətinin düzgün istiqamətləndirilməsi, gənclərdə tolerantlıq, humanizm prinsiplərinin formalaşdırılması, sağlam həyat tərzinin təbliği ilə gəncliyin inkişafına təkan vermək umumilikdə gənclər şəbəkəsinin inkişafına təkan verməkdir. Bu layihə zamanı gənclərimiz Komanda quruculuğu, Cumhuriyyət tarixi kimi bir sıra seminarlarda iştirak etmişlər. Həmçinin gənclərimiz üçün Gənclər Fondunun dəstəyi, İrəli İctimai Birliyinin təşkilatçılığı ilə Gənclər davamlı inkişaf üçün layihəsi irəli sürülmüşdür. Bu layihə isə gənclər də effektiv ünsiyyət formasının, cəmiyyətdə özünüifadə qaydalarının aşılanması,gənclər şəbəkəsinin müsbət istiqamətdə inkişafına xidmət edir. Eyni zamanda bir sıra gənclər təşkilatlarının həyata keçirdiyi layihələri də qeyd edə bilərik. Bu layihələrə pandemiya dövründə həyata keçirilən layihələri göstərə bilərik. Belə ki, "Koranavirusdan qorunmaq" Karantin qaydalarına əməl etmək" və bir sıra başqa layihələr vətəndaşların sosial baxımdan fəallığını artırıb (11).

21-ci əsr müasir texnologiyaların, ideyaların sürətlə inkişaf etdiyi bir dövrdə Təhsil Naziliyi və Heydər Əliyev fondunun dəstəyi ilə 2019-2020-ci il tədris ili üçün nəzərdə tutulmuş "STEAM Azərbaycan" layihəsini də xususilə vurğulamaq lazımdır. Bu layihənin keçirilməsində əsas məqsəd orta məktəb də təhsil alan şagirdlərimizin bir sıra bacarıqlarını-kreativlik, əməkdaşlığın inkişaf etdirilməsi, müxtəlif proqramlaşdırma dillərini tətbiq etməklə müasir İKT avadanlıqlarından istifadə edə bilmə qabilliyətlərini yüksəltməkdir. Bu layihə dünya təhsil sistemində keyfiyyətin yüksəldilməsi ilə bağlı bir çox ölkələrin diqqətini cəlb edir. Bu layihə gənclərə praktiki məşğələlər vasitəsi ilə elmi və texniki biliklərin gündəlik həyata tətbiqini göstərir. Belə ki, STEAM layihəsi gəncləri hansı peşəni seçməsindən aslı olmayaraq həyata hazırlayır. Bu layihənin tətbiqi zamanı həmçinin müxtəlif metodlardan istifadə olunur. Belə ki, layihənin tətbiq olunduğu bütün təhsil ocaqları maddi-texniki baza ilə təmin olunub, kadr hazırlıqları həyata keçirilib. Bu layihə üzrə gənclərə steam dərsləri keçirilir və steam festivalının keçirilməsi nəzərdə tutulmuşdur. Beləliklə gənclərin təhsilində mühüm rol oynayan bu layihə müvafiq olaraq uğurla başa çatdırılmışdır. Könüllülük fəaliyyəti bir sosial fəaliyyət kimi gənclərin inkişafında mühüm rol oynayır. Belə ki, könüllülük fəaliyyəti şəxsi iradə və azad seçim əsasında cəmiyyətin rifahının daha da yaxşılaşdırılmasını qarşıya məqasəd qoyan, əhalinin həssas qruplarından olan insanlara (əlillər, qocalar, kimsəsiz uşaqlar, ehtiyacı olan kəslər və s.) göstərilən fiziki və mənəvi yardım, cəmiyyətdə maarifləndirmə işinin aparılması, vətəndaş fəallığının artırılması, sağlam həyat tərzinin təbliğ edilməsi, ətraf mühitin qorunması və s. məqsədlərlə həyata keçirilən layihə və tədbirlərdə göstərilən təmənnasız sosial xidmətdir. Bu fəaliyyətin əsas üstünlüklərindən biri odur ki, gənclərdə təsəvvürlərin düzgün formalaşmasına və sağlam düşünmələrinə, şəxsi inkişafa yardım edir. Gəncləri daha məsuliyyətli olmağa, həmçinin ağıl və təşəbbüskarlığı ilə yüksək nailliyətlər əldə etməyə sövq edir. Könüllülük fəaliyyətinin gənclərimizin təhsilində və karyera yüksəlişində rolu əvəzsizdir. Könüllülük dəyərinin daşıyıcısına çevrilmiş insanlar karyeraları boyu işəgötürənlər üçün ən çox axtarılan kadrlardır. Könüllülük fəaliyyəti zamanı gənclərimiz öz biliklərini daha da zənginləşdirir və müəyyən bacarıqları üzrə daha da püxtələşirlər. Könüllülük hərəkatına qoşulan gənclərin özləri də müasir dövrün tələblərinə uyğun formalaşırlar və onların gələcək həyatda düzgün mövqe tutmağında bu fəaliyyət əsas rol oynayır. Könülülük təcrübəsi olan gənclər bu və ya bir sıra idarələrdə işə qəbul zamanı daha çox uğur əldə edir, çünki onlar ünsiyyətciliyi, bacarıqları, kollektivdə davranışı, nizam-intizamı ilə daima fərqlənir. Umumiyyətlə gənclərin Cv-yə əlavə etdikləri könüllülük fəaliyyəti baradə sertifikatlar onlar haqqında müsbət rəy deməkdir. Bugün Asan xidmət mərkəzlərində, Dayanıqlı Operativ Sosial Təminat Agentliyində könüllülük fəaliyyəti həyata keçirilir və gənclərimiz bu mərkəzlər də öz sosial fəaliyyətləri ilə xususi ilə fərqlənir. Bu zaman gənclər səmimi bir muhitdə yeni təcrübə və dost qazanmaq imkanı əldə edir, özünü ifadə üçün əlverişli imkanlar yaranır, həmçinin onların gizli qalmış bacarıq və potensiallarını üzə çıxartmaq imkanı verir. Bununla yanaşı "Regional Inkişaf" ictimai birliyi, Azərbaycan Milli QHT Forumu, "İrəli İctimai birliyi" Gənclər üçün Təhsil Mərkəzi və bir çox digər təşkilatlar da könüllülük proqramı elan edir (Adilov, 2017: 87-88).

Onu da qeyd etmək lazımdır ki, könüllük fəaliyyəti ilə məşğul olan və olmayan gənclərimiz arasındabir sıra fərqlər müşahidə olunur. İlk olaraq könüllük fəaliyyətiylə məşğul olan şəxslərin bunu CV-lərində qeyd etməsi onların işə qəbul olmaq imkanını artırır. Gənclər rahat şəkildə öz fikrini ifadə etmək bacarığını, öz potensiallnı inkişaf etdirir, sosial əhatəsi genişlənir, yeni təcrübə və dostlar qazanır. Həmçinin bu fəaliyyət zamanı özünə qapalı gənclərimiz bu kompleksindən azad olmaq imkanı əldə edir, sosiallaşır, ətrafdakı insanlarla ünsiyyəti formalaşır, yavaş-yavaş özünü daha da inkişaf etdirməyə başlayır. Könüllülük fəaliyyəti olmayan gənclərdən fərqli olaraq bu fəaliyyətlə məşğul olan gənclərimiz

asudə vaxtlarını daha səmərəli keçirir, həmçinin həyatın çətinliklərinə daha tez adaptasiya olur. Bunlarla yanaşı insanın gündəlik həyatı daha maraqlı keçməyə başlayır, əldə edilən təcrübə gəncin təhsilə marağının artmasında və iş imkanlarının genişlənməsində mühüm rol oynayır. Həmçinin könüllülük fəaliyyəti zamanı keçirilən təlim, seminarlar gənclər də nitq bacarıqlarını, bilikləri inkişaf etdirir. Ən önəmlisi könüllülük kimi sosial fəaliyyətlər zamanı gənclər nəzəri biliklərlər deyil, praktiki biliklər qazanmış olur, bir növ iş həyatına atılmış olur. Bir sözlə bu fəaliyyətlə məşğul olan gənclərimiz, digər təcrübəsiz gənclərdən hər zaman bir pillə yuxarda olur. Belə şəxslər zaman keçdikcə cəmiyyət üçün savadlı kadr olaraq formalaşır. Ümumilikdə isə, könüllülük sahəsində gənclər üçün daha böyük perspektivlərin olduğunu söyləyə bilərik (13).

Bilik yarışmaları şagird və gənclərin intelektual səviyyəsinin yüksəldilməsinə şərait yaradan sosial fəaliyyət kimi başa düşülə bilər. Belə yarışmalar orta məktəb şagirdləri arasında keçirilməklə yanaşı gənc tələbələrimiz arasında da keçirilir. Bu zaman şagirdlər və tələbələrə verilən suallar onların düşüncə tərzinin inkişafında və intelektual səviyyənin yüksəldilməsində mühüm rol oynayır. Belə yarışmalar da şübhəsiz ki, rəqabət özünü göstərir. Bəzən əyləncəli bilik yarışmaları keçirilir ki, bu da şagirdlərin marağını daha çox cəlb edir. Həmçinin gənclərimizin intelektual səviyyəsinin yüksəldilməsinə xidmət edən Bakıda "Avropa Bilik Yarışması" keçirilib. Azərbaycanın bütün bölgələrindən olan 14-26 yaşlı gənc istedadları bir araya gətirən bilik yarışması Avropanın tarixi, dəyərləri, mədəniyyəti barədə iştirakçıların biliklərini interaktiv yolla artırmaqla yanaşı, həm də onlarda komanda ruhunun və analitik bacarıqlarını inkişafına kömək etmişdir. Həmçinin bugün ki, günümüzdə gənclərimiz üçün universitetlər də debat klublar təşkil edilir. Bu dabat klublar gənclərin özünü inkişafında və təhsilində önəmli rol oynayır. Belə ki, belə debat klublar gənc tələbələrin cəmiyyətdə sərbəst şəkildə özünü ifadə etmək bacarığını aşılayır, məntiqi təfəkkürü,inkişaf etdirir və eyni zaman da fikri düzgün ifadə etməyə kömək olur.

## Nəticə

Müasir dövrümüzdə sosial fəaliyyətlərin hər birinin gənclərin təhsilində, şəxsi inkişafında və sosial həyatında rolu əvəzsizdir. Bununla yanaşı keçirilən təlim, seminar, layihələr gənclərin savadlı kadr kimi formalaşmasında mühüm rol oynayır. Beləliklə yüksək rifaha çatmaq istəyən hər bir gənc daima sosial fəaliyyətlə məşğul olmalı və özünü təkmilləşdirməlidir. Belə ki, şübhəsiz ki, sosial fəaliyyətlər gənc kadrların daha böyük, uğurlu addımlar atmasında onlara kömək olacaqdır.

## Ədəbiyyat

1. Cəfərov, E., İmaməliyev, B. (2012). Azərbaycanın ictimai həyatında gənclərin iştirakı. Bakı.
2. tps://fworks.az/training?page=7&per-page=9
3. https://adu.edu.az/az/xeberler/xeberler/5575.html
4. https://www.muallim.edu.az/news.php?id=12593http://www.ireli.az/layihe/5
5. Bədəlova, Ə. (2015). Təlim-tərbiyə. Bakı :ADPU nəşriyyatı.
6. https://az.unansea.com/t%C9%99lim-n%C9%99dir/
7. https://azertag.az/xeber/Konulluluk___genclerin_yeni_inkisaf_modeli_kimi-1254826
8. https://report.az/elm-ve-tehsil-xeberleri/bakida-avropa-bilik-yarismasi-kecirilib/
9. https://wcu.edu.az/az/activities/debate-club
10. https://oneclick.az/news/Nedir+Layihe+665
11. https://ikisahil.az/post/konulluler-ili-genclerin-sosial-mesuliyyet-hissini-guclendirecek
12. Adilov, N., Paşayev, E. (2017). Könüllülük: uğur formulu. Bakı.
13. http://www.ireli.az/layihe/5

Göndərildi: 11.05.2022 Qəbul edildi: 19.07.2022

DOI: https://doi.org/10.36719/2706-6185/13/43-46

**Elvin Elçin oğlu Mirzəyev**
Bakı Dövlət Universiteti
magistrant
elvin.mirzayev.1999@gmail.com

# PLASTİK BANK KARTLARININ YARANMA TARİXİ VƏ NAĞDSIZ ÖDƏNİŞLƏRİN İNKİŞAFINDA BANKLARIN PLASTİK KARTLARININ ROLU

**Xülasə**

Elektron biznesin inkişafının vacib problemlərindən biri səmərəli ödəmə sistemlərinin təmin edilməsindən ibarətdir. Ödəmə sistemi dedikdə, bank tərəfindən ödəmə vasitəsi kimi buraxılmış və müəyyən standarta cavab verən plastik kartların istifadə edilməsi üzrə texnoloji texnoloji metodlar çoxluğu nəzərdə tutulmuşdur. Ödəmə sisteminin normal işləməsi üçün kartlara texniki dəstək xidməti göstərən qeyri-maliyyə təşkilatları olmalıdır.Hazırda dünyada plastik kartların müxtəlif növləri mövcuddur. Ancaq onların fəaliyyət sxemləri və prinsipləri faktiki olaraq eynidir. Fərq onlar üzrə göstərilən xidmətlərin həcmində və təqdim olunan imkanlardadır.Plastik kartlar məhsul və xidmətlərə görə müştəriyə nağdsız ödəmələr etməyə və ödəmə sisteminin iştirakçıları olan bank şöbələrindən və bankomatlarından nağd pul götürməyə imkan verən fərdiləşdirilmiş ödəmə vasitəsidir. Azərbaycanda 2022-ci ilin I rübündə debet kartları ilə aparılan əməliyyatların həcmi 10922 milyon manat olmuşdur. Azərbaycanda 2022-ci ilin I rübündə kredit kartları ilə aparılan əməliyyatların həcmi 791 milyon manat olmuşdur.

***Açar sözlər:*** *elektron bankçılıq, debit kart, kredit kart, ödəniş sistemləri, nağdsız ödənişlər, inkişaf*

**Elvin Elchin Mirzayev**
Baku State University
master
elvin.mirzayev.1999@gmail.com

# The history of plastic bank cards and the role of bank plastic cards in the development of non-cash payments

**Abstract**

One of the important problems of electronic business development is the provision of efficient payment systems. Payment system means a set of technological methods for using plastic cards issued by the bank as a means of payment and meeting a certain standard. For the normal functioning of the payment system, there must be non-financial organizations that provide technical support services for cards. Currently, there are various types of plastic cards in the world. However, their operating schemes and principles are practically the same. The difference is in the scope of the services provided and the opportunities provided. Plastic cards are a personalized means of payment that allows the customer to make non-cash payments for products and services and to withdraw cash from bank branches and ATMs that are participants in the payment system. The volume of debit card transactions in Azerbaijan in the first quarter of 2022 was 10,922 million manats. The volume of credit card transactions in Azerbaijan in the first quarter of 2022 was 791 million manats.

***Keywords:*** *electron banking, debit cards, credit cards, payments systems, cashless payments, devolopment*

## Giriş

Elektron bankçılığın inkişafının vacib problemlərindən biri səmərəli ödəmə sistemlərinin təmin edilməsindən ibarətdir.Son dövr ərzində banklar tərəfindən istifadəyə buraxılan plastik kartların həcmi əhəmiyyətli dərəcədə artıb. Plastik kartlar əsasən 2 formada olur (Şəkəralıyev, 2009):

1) Debit kartlar – kart sahiblərinə öz hesablarında olan vəsait qədər pul məxaric etmək və ya öz hesablarına mədaxil etdikləri vəsaitlə alış veriş imkanı verən plastik kartdır. Kartlar debet rejimində işləyir, ancaq kart hesabında faktiki olan məbləğ daxilində xərclər aparmaq və ya bankomatlardan

nağd pul çıxarmaq imkanını verirlər. Debet kartı üzrə ödəmələr hesabda olan vəsait qalığı çərçivəsində həyata keçilir.

2) Kredit kartları – müştəriyə əvvəlcədən müəyyənləşdirilmiş limitlə müxtəlif mağazalardan alış veriş etmək, həmçinin nağd pul məxaric etmək imkanı verən plastik kartdır.

Nağdsız hesablaşmaların əsas məqsədi (Məmmədov, 2003):

1) Mülki dövriyyənin iştirakçıları arasında aparılan əməliyyatların və hesabatların şəffaflaşdırılması
2) İstehlakçıların hüquqlarının müdafiəsini təmin etmək
3) Nağd pul hesablaşmalarının nağdsız hesablaşmalarla əvəzləşdirilməsini stimullaşdırmaq
4) Bank sisteminin inkişafını sürətləndirmək

Nağdsız hesablaşmalar dedikdə aşağıdakılar nəzərdə tutulur (Məmmədov, 2010):

1) Bir şəxsin bank hesabından digər şəxsin bank hesabına köçürülməklə və ödəniş vasitəsilə həyata keçirilən hesablaşmalar
2) Ödəniş terminalları vasitərilə həyata keçirilən hesablaşmalar
3) Birbaşa nağd qaydada satıcının bank hesabına köçürülməklə həyata keçirilən hesablaşmalar

Hazırda dünyada plastik kartların müxtəlif növləri mövcuddur.Ancaq onların fəaliyyət sxemləri və prinsipləri faktiki olaraq eynidir. Fərq onlar üzrə göstərilən xidmətlərin həcmində və təqdim olunan imkanlardadır (Qruber, 2022). Sahibkarlar, kartı alan zaman bankla razılığa girməmişdən əvvəl bankın yeterli sayda kart sahibi olub olmadığına diqqət etməlidirlər. İnsanlar alacaqları kartın mümkün olduqca daha çok yerlərdə qəbul edilməsinə üstünlük verirlər. Bu baxımdan kart ixrac edən və ya yayımında vasitəçilik edən banklar, həm kart sahibləri həm də kartı qəbul edən tərəflər arasında uyğun bir bazar yaratmağa çalışırlar (Abbasov, 2003).

Plastik kartlar aşağıdakı imkanları verirlər:

1) Pul vəsaitlərinin rahat və təhlükəsiz saxlanılması. Çünki kart məxfi PİN-kodla qorunur və plastik kartın itirildiyi və ya oğurlandığı hallarda hesabdakı vəsait olduğu həcmdə qalır;
2) Dünyanın istənilən nöqtəsində, sutkada 24 saat ərzində, banka müraciət etmədən, bankomatlardan pul vəsaitinin çıxarılması;
3) Ölkə daxilində və onun hüdudlarından kənarda malların və xidmətlərin ödənilməsi;
4) İnternet vasitəsilə həyata keçirilən "on-line" sifarişlərin ödənilməsi;
5) Kart hesabınızdakı hər hansı dəyişikliklər barədə ətraflı hesabatın alınması;
6) Şəxsi məsrəflərin və gəlirlərin kart hesabı üzrə alınmış çıxarışların əsasında təhlil edilməsi və planlaşdırılması;
7) Bir hesaba ailə üzvləri üçün bir neçə əlavə kartın, onlara müəyyən limit müəyyən etməklə və ya limit müəyyən etməklə rəsmiləşdirilməsi

Plastik ödəniş kartların istifadəsində 3 əsas istiqamət mövcuddur (6):

1) fiziki şəxslər üçün plastik kartlar
2) nümayəndəlik xərcləri üçün korporativ kartlar
3) əmək haqqı kartları

Ödəmələrin bu sisteminin tətbiqini beynəlxalq aləmdə daha da təkmil formada tətbiq etmək məqsədi ilə Qərbdə İSO (Internarional Standarts Organisation) Beynəlxalq Standartlar Təşkilatı yaradıldı. Plastik kartların dünyada tanınmış VİSA, MASTER CARD, AMERİCAN EXPRESS kimi emitentləri bu təşkilatın üzvləri oldular (Mikayılov, 2013). Bu təşkilat tərəfindən plastik kartların ümumi xarici görünş standartı, hesabların nömrələnməsi qaydası, maqnit xətlər formatı aparılan əməliyyatlar barəsində kart sahibinə göndərilən məlumatlar formatının standartları işlənib hazırlandı. Məhz həmin standartlar bütün dünyada tətbiq edilir.Hal hazırda dünyanın 200-dən arıq öləsində pul dövriyyəsi sahəsində plastik kart-lardan istifadə edilir. Qərbin sənayecə inkişaf etmiş ölkələrində plastik kartlar daha geniş tətbiq edilərəkvə çek kitabçalarını tədricən sıxışdırır (Mişkin, 2021). Kartların ən böyük üstünlüyü həm də ondadır ki, pulumuzun oğurlanmasını qeyri-mümkün edir. Əgər kart ogurlanarsa, banka xəbər verib ödəməni dayandırırıq. Oğru isə kodu bilmədiyi üçün kartımızdan istifadə etmək imkanından məhrum olur.

Hesablaşmaların həyata keçirilməsi üçün istifadə olunan bütün plastik kartlar iki yerə ayrılırlar :

1) Şəxsi kartlar
2) Korporativ Kartlar

Şəxsi kartları banklar ayrı-ayrı şəxslərə, özünün ödəmə qabiliyyəti olan müştərilərinə verirlər. Bundan başqa, banklar şəxsi kartları digər tanımadıqları şəxslərə də verə bilərlər (9). Bunun üçün bank tərəfindən həmin şəxslərin ödəmə qabiliyyətləri öyrənilməli, "kredit tarixləri" nəzərdən keçirilməlidir.

Həmin şəxslər bankda cari hesab açmalı və bu hesaba sığorta depoziti keçirməlidirlər.

Korporativ kartlar banklar tərəfindən hüquqi şəxslərə onların təminatı əsasında verilir (10). Belə kartları vermək üçün bank mütləq həmin hüquqi şəxsin ödəmə qabiliyyətini yoxlamalıdır.

Funksional əlamətlərinə görə şərti olaraq plastik kartlar yeddi növə və iki qrupa bölünürlər. Birinci qrupa maqnit kartları, ikinci qrupa isə elektron kartlar aid edilir.

1) Maqnit kartlar
➢ kredit kartlar
➢ ödəmə (debet ) kartları
➢ ekzekyutiv (icra) kartları
➢ çek təminat kartları
➢ alıcılıq qabiliyyəti qeyd olunmuş kartlar

2) Elektron kartlar
➢ mikroprosessor kartlar
- yaddaş kartları
- intellektual kartlar ( Smart cards )
- superintellektual kartlar ( Supersmart cards )

➢ lazer kartlar

Plastik kartlar içərisində ən sadə, adi kartlar alıcılıq qabiliyyəti qeyd olunmuş kartlardır. Bir qayda olaraq onun qabaq üzündə istehsalçının adı, onun firma nişanı, onun sahibinin adı və identifikasiya kodu əks etdirilir (Aslanov, 2014). Arxa tərəfdə isə sahibin imzası əks etdirilir. Plastik kartlarla hesablaşmaların həyata keçirilməsinin mağazalar, digər ticarət və xidmət təşkilatları üçün üstün və çatışmayan cəhətləri vardır.

Plastik kartlarla nağdsız əməliyyatların keçirilməsinin mağazalar, digər ticarət və xidmət təşkilatları üçün üstün cəhətləri (Sadıqov, 2010):

1) Plastik kartlarla hesablaşmaların aparılması çoxslu sayda yüksək imkanlı müştəri cəlb olunmasını təmin edir, bu isə öz növbəsində mal dövriyyəsini, xidmətin həcmini artırır

2) Plastik kartlarla hesablaşmalar həyata keçirildiyi halda nə mağazalar, nə də ki, xidmət təşkilatları valyuta mübadiləsi və nağd pul inkassasiyası qayğılarından azad olurlar

3) Plastik kartlarla hesablaşmaları apararaq mağazalar və xidmət təşkilatları nağd pullarla əməliyyat zamanı ortaya çıxan risklərdən azad olurlar

4) plastik kartlarla əməliyyatlar mağazaların və xidmət təşkilatlarının nüfuzunu, reytinqini yüksəldir. Plastik kartlarla nağdsız əməliyyatların keçirilməsinin mağazalar, digər ticarət və xidmət təşkilatları üçün çatışmayan cəhətləridə vardır (Muxtarov, 2013). Mağazalar və xidmət təşkilatları plastik kartlarla əməliyyatlar aparmaq, bu əməliyyatları həyata keçirmək, lazım olan avadanlığı almaq və ya icarəyə götürmək üçün müəyyən məsrəflərə yol verməli, eyni zamanda həmin avadanlığı işlək vəziyyətdə saxlamaq üçün cari xərclər çəkməlidir.

Plastik kartlarla əməliyyat aparılması banklar üçün bir çox səbəblərdən əhəmiyyət kəsb edir. Bu səbəblər aşağıdakılardır (Əkbərov, 2011):

1) Plastik kartlarla əməliyyatlar banklara cəlb olunmuş vəsaitlərin həcmini artırmağa imkan yaradı

2) Müştərilər banklardan kartları alarkən kart üçün haqq ödəyirlər. Eyni zamanda kartlar vasitəsilə aparılan bütün növ əməliyyatlar üçün bank komisyon haqqı alır

3) Ödəmə dövriyyəsindən nağd pulların və çeklərin sıxışdırılıb çıxarılması meyli istiqaməti üzrə bankın rəqabət potensialı güclənir

4) Plastik kartlardan istifadə innovasiya prosesinin iştirakçısı kimi bankın nüfuzunu artırır.

Plastik kartların yaranması tarixinə nəzər yetirdikdikdə keçmiş dövrlərdə informasiya texnologiyanın zəif inkişaf etməsi bu sektordada öz təsirini göstərdiyini görmək olar.Plastik kartların yaranma tarixni aşağıdakı ardıcıllıqla qeyd etmək olar (Bəşirov, 2012):

1) İlk plastik kart olan Diners Club plastic kartı 1950-ci ildə restoranlarda hesabı ödəmək üçün yaradılmışdır.

2) Daha sonra 1958-ci ildə Bank Americard Bank of America tərəfindən yaradılmışdır (sonradan Visacard).

3) 1967-ci ildə 4 Kaliforniya Bankı tərəfindən MasterCharge kredit kartı proqramı yaradılmışdır (1979-cu ildən Mastercard).

Ödəmə sisteminin normal işləməsi üçün kartlara texniki dəstək xidməti göstərən qeyri-maliyyə təşki-

latları olmalıdır. 2022-ci il mart ayının məlumatına əsasən, dövriyyədə olan ödəniş kartlarının sayı fevral ayına nisbətən 243 min ədəd artaraq 11 milyon 771 min ədəd olmuşdur. Bu göstərici 2021-ci ilin müvafiq dövrü ilə müqayisədə 20,5% artmışdır (Rudiy, 2009). Ümumiyyətlə, ödəniş kartlarının sayının artması nağdsız ödənişlərinin həcminin artmasına müsbət təsir göstərir. Plastik kartlar məhsul və xidmətlərə görə müştəriyə nağdsız ödəmələr etməyə və ödəmə sisteminin iştirakçıları olan bank şöbələrindən və bankomatlarından nağd pul götürməyə imkan verən fərdiləşdirilmiş ödəmə vasitəsidir (Sadıqov, 2003). Azərbaycanda 2022-ci ilin I rübündə debet kartları ilə aparılan əməliyyatların həcmi 10922 milyon manat olmuşdur. Mart ayında bu göstərici 4146 milyon manat təşkil etmişdir. Bu fevral ayı ilə müqayisədə 579 milyon manat artım deməkdir. Azərbaycanda 2022-ci ilin I rübündə kredit kartları ilə aparılan əməliyyatların həcmi 791 milyon manat olmuşdur. Mart ayında bu göstərici 284 milyon manat təşkil etmişdir. Bu fevral ayı ilə müqayisədə 36 milyon manat artım deməkdir (Məmmədova, 2009).

## Nəticə

60 cı illərə qədər kredit kartlarının istifadə səviyyəsi çox aşağı səviyyədə olmuşdur. Kredit karları yalnız bahalı alışları həyata keçirə biləcək az sayda müştərilərə verilirdi. Çünki, kredit kartlarının trazaksiya xərcləri, kartın saxlanma xərcləri yüksək xərc tələb edirdi. Lakin sonralar informasiya texnologiyalarının inkişaf etməsi bu xərclərin aşağı salınmasına imkan verdi (Musayev, Əlizadə, Mahmudov, 2016). Xərclərin aşağı düşməsi kredit kartlarının istifadəsini genişləndirdi. İnkişaf etmiş ölkələrin timsalında belə bir statistikaya nəzər yetirək. 1970-1971 ci illərdə Böyük Britaniyada yalnız bir kredit kartı növü mövcud idi. 2000-ci ildən artıq banklar müştərilərə 1300-dən artıq kredit kartı növü təklif edirdilər. Bu statistikadan göründüyü kimi kredit kartlarında istifadə əhəmiyyətli dərəcədə genişlənmişdir ki, bunun əsas səbəbidə informasiya texnologiyalarının inkişaf etməsidir (Bağırov, 2003).

## Ədəbiyyat

1. Şəkəralıyev, A. (2009). Dövlətin iqtisadi siyasəti: reallıqlar və perspektivlər. Bakı.
2. Məmmədov, Z. (2003). Bank işi və e-bankçılıq. Bakı.
3. Məmmədov, Z. (2010). Pul, kredit və banklar. Bakı.
4. Qruber, C. (2022). Dövlət Maliyyəsi və Dövlət siyasəti. Bakı.
5. Abbasov, Ə. (2003). Bank işi və Beynəlxalq Bankçılıq. Bakı.
6. www.cbar.az
7. Mikayılov, Q. (2013). Azərbaycan Bank sisteminin maliyyə analizi. Bakı.
8. Mişkin, F. (2021). Pul,Bank və maliyyə bazarlarının iqtisadiyyatı. Bakı.
9. www.stat.gov.az
10. www.economy.gov.az.
11. Aslanov, A. (2014). Maliyyə və bank statistikası. Bakı.
12. Sadıqov, E. (2010). Bank əməliyyatları. Bakı.
13. Muxtarov, Ş. (2013). Azərbaycan Bank sisteminin maliyyə analizi. Bakı.
14. Əkbərov, M. (2011). Elektron kommersiya. Bakı.
15. Bəşirov, R. (2012). Pul və Banklar. Bakı.
16. Rudiy, K. (2009). Xarici ölkələrin maliyyə-kredit sistemi. Bakı.
17. Sadıqov, M. (2003). Xarici ölkələrin pul-kredit sistemi. Bakı.
18. Məmmədova, N. (2009). Maliyyə və Kredit. Bakı.
19. Musayev, İ., Əlizadə, M., Mahmudov, A. (2016). Elektron Biznes. Bakı.
20. Bağırov, M. (2003). Banklar və Bank əməliyyatları. Bakı.

Göndərildi: 24.04.2022 Qəbul edildi: 02.07.202

# İÇİNDƏKİLƏR



---

İmzalandı: 26.07.2022
Formatı: 60/84, 1/8
H/n həcmi: 5,75 ç.v.
Sifariş: 548

https://aem.az saytında çap olunub.
**Ünvan:** Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.
“Azərbaycan” nəşriyyatı, 6-cı mərtəbə.
Tel.: +994 50 209 59 68
+994 55 209 59 68
+994 12 510 63 99
e-mail: info@aem.az